# MƏHƏMMƏD PEYĞƏMBƏRIN (S.Ə.S) XRISTIANLARA 6 VƏDI

## CON ENDRYU MORROU (İLYAS ABDƏL – ALİM İSLAM)

*NƏŞİRİN RƏHBƏRİ* PƏRVİZ EYYUBOV
*MƏSLƏHƏTÇİ* ADIGÖZƏL MƏMMƏDOV
*TƏRCÜMƏ EDƏN* RƏFİQƏ ŞƏMS, İBRAHİM İLYASLI
*REDAKTOR* İBRAHİM İLYASLI

# Mündəricat

Fəsil 1:Məhəmməd Peyğəmbərin Sinay dağları rahiblərinə Vədi

Fəsil 2: Məhəmməd Peyğəmbərin Fars xristianları ilə Müqaviləsi

Fəsil 3: Məhəmməd Peyğəmbərin Nacran xristianları ilə Mühafizə Fərmanı

Fəsil 4: Məhəmməd Peyğəmbərin dünya xristianları ilə Sazişi (Karmel dağları əlyazması)

Fəsil 5: Məhəmməd Peyğəmbərin dünya xristianlarına Vədi (Qahirə əlyazması)

Fəsil 6: Məhəmməd Peyğəmbərin assuriya xristianlarına Vədi; Con Morrounun "Məhəmməd Peyğəmbərin xristianlara Vədləri" kitabı

# FƏSİL 1

# MƏHƏMMƏD PEYĞƏMBƏRİN SİNAY DAĞLARI RAHİBLƏRİNƏ VƏDİ

[*Con Endryu Morrounun 2013-cü ildəki tərcüməsi*]

*Mərhəmətli, Rəhmli Allahın adı ilə!*

Abdullahın oğlu Məhəmmədin əmriylə yazılmış Vədin Əlyazması, *(Allah onu, müsəlmanları və bütün xristianları qorusun!)*

Bu vəd Abdullahın oğlu, Allahın müjdəçisi, Allahın xəlq etdiklərinin himayədarı Məhəmməd peyğəmbərin əmriylə yazılmışdır. Allaha heç kəs şübhə edə bilməz, çünki o qüdrətli və hər şeyi biləndir.

O dindar müsəlmanlar adından Himayəçi Vəd kimi, fərq etməz, Qərb ya Şərq, yaxın ya uzaq, ərəb ya qeyri-ərəb, məlum ya naməlum - xristian dinli hər kəsə hədiyyə olaraq verilmişdir.

Burda göstərilir ki, bu Vədi pozan istənilən müsəlman əgər ona qarşı çıxar və yaxud onun qoruyucu Vəd olduğunu inkar edərsə, deməli, o, Allahın sözünə sayğısızlıq göstərir, onun dinini təhqir etmiş olur, odur ki, kimliyindən asılı olmayaraq sultanı da, adi dindar müsəlmanı da Allah cəzası gözləyir.

Əgər hansısa rahib, səyyah, zəvvar dağlarda, vadidə, mağaralarda və əkin yerlərində, səhrada, yaxud kilsədə qoruyucu axtararsa, o zaman mən onları mühafizə etmək üçün qalxana çevriləcəyəm.

Silahdaşlarım, etiqad edənlərim və ardıcıllarım yadda saxlamalıdırlar ki, monarxlar və zəvvarlar mənim qəyyumum və rəiyyətimdirlər.

Yepiskop kilsə okruqundan, rahib monastrdan, zahid obiteldən (köhnə monastr) uzaqlaşdırılmamalı, zəvvar və səyahətçilərin yolu kəsilməməlidir.

Bir kilsə binası dağıdılmayacaq, kilsələrin mülkiyyəti məscid və evlərin tikilməsinə sərf olunmayacaq.

Kim bu qadağalara məhəl qoymazsa, deməli, o, Allahın buyruğuna qarşı çıxır və Allahın elçisinin iradəsinə qarşı gedir.

Rahiblərin, yepiskop və möminlərin üzərinə nə can vergisi, nə də digər yığımlar qoyulmamalıdır, bu halda mən onların müdafiəsində duracağam. Onlar harda olursa olsunlar, - quruda ya suda, Şərqdə ya Qərbdə, Şimalda ya Cənubda, fərq etməz, - mənim nəzərim həmişə onların üstündə olacaq. Vədimə müvafiq olaraq, onlar hər cür təzyiq və sıxıntıdan mühafizə ediləcəklər.

Dağlarda və müqəddəs monastrlarda tərkidünya həyat tərzi yaşayanlar can vergisi, torpaq vergisi, desyatin və rüsumlardan azad olmalıdırlar, çünki onlar öz istifadələri, tələbatları üçün əkib-becərirlər.

Bundan başqa, əgər məhsul olmazsa, onlara kömək göstərilməli, ərdəbdən hərəsinə bir qədəh verilməlidir.

Onlar müharibədə iştirak etməyə borclu deyil və can vergisi ödəməməlidirlər.

Hətta torpaq vergisi verməyə borclu olanlar - torpaq mülkiyyəti olanlar, yaxud ticarət ilə məşğul olan adamlar bir il müddətində adambaşına on iki dirhəmdən artıq vergi ödəməməlidirlər.

Onların üzərinə ədalətsiz vergi qoymaq olmaz, dini kitablar oxuyan adamlarla, hansısa dinin digərlərindən üstün olduğu barədə mübahisə etmək olmaz, hər şey vicdan və namusla həll edilməlidir. Biz onları mərhəmətimizin qanadları altına alırıq. Qarışıqlıq, dava və çəkişmələri onların yaşayış yerləri, yaxud məskunlaşmaq istədikləri məkanlardan aralıda saxlamağa çalışacağıq.

Əgər xristian qadın müsəlman ailəsinə daxil olarsa, onu mehribanlıqla qarşılamaq, ona öz kilsəsində ibadət etməyə imkan vermək, onun öz dindaşları ilə olan mübahisəsinə girişməmək lazımdır.

Allahın bu vədinə qarşı çıxan hər kəs öz Yaradanının nəzərində qiyamçı kimi qalır.

Bu adamlara yaşayış evlərinin və ibadətgahlarının qorunmasında yardımçı olmaq lazımdır. Əgər onlar öz inamlarında mökəmdirlərsə, bu vəsiyyətə mütləq əməl edəcəklər.

Onlardan heç biri silah daşımağa məcbur edilməməli, əks halda müsəlmanlar onları müdafiə etməlidirlər.

Heç kəs bu qoruyucu Vədi dünyanın sonuna və ömrü bitənə qədər pozmayacaq.

Bütün xristianlara Abdullahın oğlu, Allahın elçisi Məhəmməd s.ə.s. tərəfindən verilən Vədə şahid kimi aşağıdakı şəxslər cavabdehliklə əl basmışlar.

Əli Əbu Talib oğlu, Əbu Kuhaf oğlu Əbu Bəkr, Ömər əl-Xəttab oğlu, Osman Əffan oğlu, Əbu-əl-Darda, Əbu-Hurayra, Abd-əllah Məsud, Abbas Əbdəl Mütəllib oğlu, Haris Sabit oğlu, Abdəl Həsən Əzim oğlu; Füdayil Abbas oğlu, əl-Zübeyir əl-Əvvam oğlu; Təlxoy Abd-əllah oğlu; Saad Müəz oğlu; Sədi Ubadi oğlu; Sabit Nafis oğlu; Zeyd Sabit oğlu, Əbu Hənifə Übəyya oğlu, Həşim Übeyid oğlu, Müəzzəl Qüreyş oğlu; Abd-əllah Əmru oğlu, Əmir əl Əsa oğlu; Ömmər Yasir oğlu.

Bu Vədi Abu Talibin oğlu İmam Əli şəxsən öz əli ilə Peyğəmbərin məscidində hicrətdən 2 il sonra məhərrəm ayının üçündə yazmışdır.

Bu Vədin surəti Sultanın xəzinəsinə verilmişdir. Məhəmməd peyğəmbərin möhürüylə təsdiqlənmiş Vəd, Taif dərisindən olan parçanın üzərində yazılmışdır. Peyğəmbərin vəsiyyətlərinə əməl edən hər kəs onun xeyir-duasını almış olur. Bu xeyir-duanı alan adamlar həm də Allahın

onların günahlarını bağışlayacağına əmin ola bilərlər. Bu, mərhəmətli sultanın (Misirin işğalından sonra 1517-ci il Osmanlı imperiyasının sultanı I Səlim) imzası ilə təsdiqlənmiş sənədin əslinin surətidir. Əsli isə dindarların rəhbəri olan İmam Əli Abu Talib oğlu (Allah onun müqəddəs ruhuna nur çiləsin!) tərəfindən yazılmışdır.

Xeyirxah Sultanın əmriylə, İlahi qüdrətdən yaranan sənəd Sinay dağları rahiblərinə verilmiş və bu gün də öz qüvvəsində qalır. Rahiblərə ona görə bu sənədin surəti verilir ki, onun İmam Əli tərəfindən yazılmış surəti yoxa çıxmışdır.

Bu minvalla, rahiblərin himayəsi Sultanın məhz özü tərəfindən təmin edilir.

Sənədin əsli yenidən, onda heç bir dəyişiklik aparılmadan, olduğu kimi, Allahın sadiq qulu Əhməd əl-Ansarinin oğlu Əl-Bari Nuh tərəfindən hasil edilmişdir. Misir hakimi onu öz zəmanətiylə təsdiq etmişdir. Dairəvi möhürlə təsdiqlənmiş və rəsmiləşdirilmişdir.

Əl-Ansari oğlu Nuh Əhməd.

[İmza]

Möhür orijinal nümunəsi əsasında düzəldilmiş və usta Məhəmməd əl-Kadi tərəfindən imzalanmışdır, o özü Qədim Misirdən idi, Allah bağışlasın!

# FƏSİL 2

# MƏHƏMMƏD PEYĞƏMBƏRİN FARS XRİSTİANLARI İLƏ BAĞLADIĞI MÜQAVİLƏ

[*Leon Arpidən sitat gətirilir, 1946*]

*Mərhəmətli, Rəhmli Allahın adı ilə!*

Qoy bu dini Sənəd hamıya bir Müqavilə və Sazişin Əlyazması kimi məlum olsun və bütün xristian xalqları harada - Ərəbistanın Şərqində, İranda, yaxud onların hüdudlarından kənarda, öz dindaşları ilə sıx əlaqəli, yaxud ayrı yaşamalarından asılı olmayaraq, ona tabe olmalıdırlar. Bu Saziş və Müqavilə hər cür itaətkarlığa layiqdirlər və onlar həmçinin bütün müsəlmanları, onların müddəalarına əməl etməyə dəvət edir. Hər kəs özünə müqəddəs borc bilib bu Müqaviləni oxuyaraq, onun buyurduqlarına əməl etsə, həmin adamın inancı xeyirxah bir iş kimi qəbul ediləcək və layiqincə qiymətləndiriləcək. Əksinə, hər kəs Sazişin sözlərini özbaşına inkar etsə, ona müqavimət göstərib, dəyişilməsinə çalışsa, Allaha dönük çıxan kimi qiymətləndiriləcək. Eləcə də istər şah olsun, istərsə də rəiyyət, istər adi müsəlman, istərsə də xristian dindarı olsun, əgər bu dini Sənədi qəbul etməyib pisləsə, layiqli cəzasını alacaq.

Allahın izniylə, bu müqavilənin mətninə, onun öz əslinə uyğun olduğunun təsdiqi ilə başlamaq daha münasibdir.

Mən bu Vədi möhkəm əllə ən layiqli adamlara verirəm. Bu Vədin, indi haqqında danışacağım müddəalarına mənim bütün adamlarım əməl etməlidirlər.

Möminlər də, yaxında ya uzaqda olmasından asılı olmayaraq, dindarları müdafiə edər və onlara kömək etməyi özləri üçün müqəddəs borc bilərlər.

Bütün xristian dünyasında o yerləri daha çox qorumaq lazımdır ki, oralarda Allaha xidmət göstərənlər, rahiblər və keşişlər otururlar.

Şarda – şəhərdə, kənddə, vadidə, dağda, yaxud səhrada, bir sözlə, ayaqları dəyən hər hansı bir yerdə məskunlaşmalarından asılı olmayaraq, onlar özlərinin mühafizə olunduqlarını hiss etməli, istər Qərbdə, istərsə də Şərqdə dinlərinin, xüsusi mülkiyyətlərinin qorunduğuna əmin olmalıdırlar.

Müsəlmanlar məni duyduqları və hörmət etdikləri kimi, bizim mühafizəmiz altında olan hər bir xalqa da istənilən fəlakət və iğtişaş zamanı kömək edib, onların qayğısına qalmağı özlərinə borc hesab etməlidirlər, ona görə ki, onlar mənim xalqımın bir hissəsi olaraq, öz sözlərinə və köməkçilərinə sadiqdirlər.

Odur ki, mən onları mühafizə edib, qorumaq marağındayam, hətta hər hansı müqavimət yaxud təbii fəlakət zamanı abır-həyanı atıb onları qarət etmək olmaz. Vergi yığılarkən onların imkanı nəzərə alınmalı, heç bir güc və məcburiyyət tətbiq edilmədən qazancları ilə ödədikləri vergi arasındakı mütənasiblik qarşılıqlı razılıqla qorunmalıdır.

Onların quruculuq fəaliyyətlərinə müdaxilə etmək olmaz, öz vəzifəsini icra edən keşişə mane olmaq olmaz, dininə və adətlərinə görə o təqib edilməməlidir, qoy onlar öz ibadət yerlərində ənənələrinə uyğun dua etsinlər; onların kilsələrinin sökülüb-dağıdılmasına yol verilməməliidir. Evləri və yaşayış yerləri müsəlman hökuməti, yaxud məscid tərəfindən ləğv edilə bilməz. Kim mənim sərəncamıma müqavimət göstərib, onun ziddinə çıxarsa, o, müqaviləni pozan, Allahın buyruğuna və onun elçisi olan peyğəmbərə dönük çıxan adam kimi dəyərləndiriləcək.

Onlardan dörd dinardan və bir kətan döşəkağıdan artıq torpaq vergisi alınmamalıdır, müsəlmanların rifahı naminə toplanan gəlir etibarlı bir xəzinədə adamların ehtiyacını ödəmək üçün qorunmalıdır.

Sazişdə göstərilən vergilərdən əlavə gizli (məsələn, can vergisi) vergi yığıla bilməz.

İstər tacir olsun, istər ağa, istər geniş səhralarda yaşasın, istər dənizdən balıq tutsun, ya mirvari çıxarsın, istər mədənlərdən zər-gümüş, qiymətli daşlar qazıb çıxarsın, istər malikanəyə sahib olsun, dəxli yoxdur, on iki dirhəmdən artıq vergi verməməlidir.

Xristian dinindən olmayan və xristian ənənələrinə uyğun Allaha xidmət etməyənlər dörd dirhəm cərimə ödəyəcəklər.

Lakin bu xalqa mənsub olan və buyruğa əməl edənlər də yuxarıda deyildiyi kimi, öz adamları arasında yaşamaq şərtilə on iki dirhəmdən artıq vergi ödəməməlidir.

Səyyar həyat yaşayan, evi-eşiyi olmayan adamlardan torpaq vergisi tutulmamalıdır. Bundan əlavə, onlardan kimsə mülkə, vərəsəliyə sahib olarsa, imamın qanuni haqqına görə o kəsdən vergi tutulur. Lakin vergi ödəyən şəxs zorakılığın qurbanı olmamalı, ödəmə qabiliyyəti nəzərə alınmalıdır. Onun xüsusi mülkü, ərzağı, əməyinin məhsulu tamah obyektinə çevrilməməlidir.

Din düşmənləriylə vuruşarkən xristianlardan tələb etmək olmaz ki, müsəlmanlar tərəfindən vuruşsunlar. Lakin müsəlmanlar xarici ölkələrlə müharibə edərlərsə, bıçaqlaşma yaxud qırhaqır olarsa, belə halda ümumi düşmənə qarşı müsəlmanlarla xristianların birləşməsi istisnalıq təşkil edir. Əgər düşmən xristianın üstünə hücum edərsə, onda müsəlmanlar düşmənə qarşı mübarizədə öz atlarını, xəncər və nizələrini əsirgəməməlidirlər. Bununla onlar xeyirxah xidmət göstərmiş olurlar.

Xristianı zor gücünə müsəlmanlığı qəbul etməyə məcbur etmək olmaz və bununla bağlı heç bir mübahisəyə gedilməməlidir. Ən yaxşı yol razılıq yoludur.

Bütün dünyada müsəlmanlar xristianlara xeyirxahlıq və mərhəmət əli uzatmalı, onları qəsbkar döyüşlərindən qorumalıdırlar. Əgər xristian müsəlmanı bilməyərəkdən incidibsə, müsəlmanlar kömək məqsədilə onu məhkəməyə aparmalıdırlar ki, orada ondan Allahın buyurduğundan artıq cərimə tutulmasın və sazişə əsasən hər iki tərəf arasında sülh bağlansın.

Əgər adı çəkilən göstərişlərə əməl edibsə, can vergisi ödəyibsə, bir xristian belə qəddarlıqdan əziyyət çəkməməli, mənim ümmətim tərəfindən istismar edilməməlidir. Lakin xristianlar da bu gündən etibarən Allahın izni olmadan müsəlmanlara zülm edə bilməz.

Müsəlmanlar xristian qadın və qızlarını zorla ala bilməzlər. Müsəlmanın onlarla daimi yaxud müvəqqəti birliyi yalnız könüllü razılıq və Allahın izni əsasında mümkündür. Bu, ona görə belə qərarlaşdırılıb ki, qadınlar özlərinin seçib-sevdikləri adamlara ərə getmək imkanında olsunlar.

Xristian qadını müsəlmana ərə gedərsə, ona öz dinində qalmaq və dini məbədlərinə gedə bilmək səlahiyyəti verilir ki, məxsus olduğu dinin qanunları çərçivəsində rahat yaşaya bilsin.

Onun öz dindaşları ilə ünsiyyətə girməsinə, keşiş və rahiblərlə məsləhətləşməsinə qadağa qoymaq, onu zorla dinini dəyişməyə məcbur etmək olmaz.

Kim müqavilənin bu şərtlərini pozarsa, Allaha dönük çıxan bir adam kimi peyğəmbərin nəzərində günahkar bəndə sayılacaq. Onu Allaha asi olanlar cərgəsində görəcəklər.

Xristianlar öz kilsələri və monastrlarında aparılan təmir işlərində iştirak etməlidirlər. Əgər müsəlmanlar xristianlara kömək üçün müraciət edərlərsə, o zaman müsəlman icmaları və dininə xeyirxah münasibət göstərmək naminə xristianlar bu xahişi rədd etməməli, dostluq və könüllülük prinsipinin ifadəsi kimi, öz imkanları daxilində köməklik göstərməlidirlər.

Etiraf olunmalıdır ki, xristianlar bizə tabedirlər, bizdən sığınacaq və müdafiə olunmaqlarını xahiş edərsə, onlara sözsüz ki, etibarlı, qanuni kömək göstərməliyik. Əgər hər hansı bir xristian, diplomatik nümayəndə qismində müsəlmanlarla, yaxud dinsizlərlə sülh danışıqları aparmaq məqsədilə səfərə çıxarsa, heç kəs onun bu məramına qarşı çıxa bilməz. Bu səfər bizim işimizin xeyrinə olarsa, onun xidmətini qəbul etmək gərəkdir. Kim ona öz nifrətini bildirsə, həmin adam natəmiz və günahkar bəndə kimi Allahın elçisinə və onun buyurduqlarına qarşı çıxanlardan sayılacaq.

Onun ardınca Allahın böyük elçisi olan Məhəmməd peyğəmbərin müqaviləsinə əməl etmək, yeni nəslə Allahın xeyir-duası ilə (xristianlarla birlikdə) çatdırmaqdır.

Yuxarıda deyilənlərdən sonra Məhəmməd peyğəmbərin s.a.s xristianlarla bağladığı bu müqavilə, onların dini qanunları, dinləriylə bağlı bir çox ehkamları özündə əks etdirir ki, xristianların onlara əməl etməsi vacibdir. Qoy bu deyilənlərə qarşı çıxmasınlar və hər şey aşağıdakı sözlərlə uyğunluq təşkil etsin.

Müqavilədəki ehkamlardan biri budur: xristianlar dinsizlərə istər aşkar, istərsə də gizli heç bir kömək göstərməməli, düşmənlərin istənilən vaxt rahatca üstümüzə hücum çəkməyə imkanı olsun deyə onları öz evlərində gizlətməməlidirlər.

Onlar düşmən postunda dayanan əsgərləri öz evlərinə və kilsələrinə buraxmamalı, onlara nizə, ox, qılınc, at və başqa bu kimi şeylərlə yardım etməməlidirlər.

Xristianlar düşmənlərimizə bələdçi qismində xidmət etməməli, onlara pusqularını qurmaq üçün yer göstərməməlidirlər. Onlar düşmənə məxsus əşyaların təhlükəsiz qorunmasını öz öhdələrinə götürməməlidirlər; düşmənlə ünsiyyətə girməməli (məcburi hallar istisna olmaqla), onlara söz və əməllə yardım etməməli, sığınacaq verməməlidirlər.

Əgər müsəlman təsadüfən xristian evinə düşərsə, o həmin evdə ancaq üç gün, üç gecə qala bilər, ondan artıq qalmağına lüzum yoxdur. Əgər müsəlmana qarşı sui-qəsd hazırlanır, yaxud qəddarcasına zalımlar tərəfindən sıxışdırılırsa, xristianlar onun köməyinə gəlməlidirlər.

Hər kəs müsəlmanı düşməndən qorumaq üçün, onu öz evində gizlədərsə, o zaman ona yatmaq üçün yer verməli, qayğısına qalmalı, gizləndiyi müddətdə yeməklə təmin etməlidir. Gizlənməyə məcbur olan qadın və uşaqların yerini düşmənə bildirməməlidir. Bu əmrin toxunulmazlığını hər bir xristian bilməli və onu qəbul etməlidir.

Əgər xristian bu müqavilənin əleyhinə çıxıb, ona etinasızlıq göstərərsə, o, dininə dönük çıxan və cinayətkar adam sayılacaq. Belə adam Allahın nəzərindən düşdüyü üçün peyğəmbər ona ədalətli cəza verəcəkdir.

Odur ki, xristianlar bu müqavilənin vacibliyini anlayıb, ona, Allahın buyurduğu vaxta qədər əməl etməlidirlər.

Bütün bunlar, rahiblərin və ölkə əyanlarının iştirakıyla sənəddə imza ilə təsdiqlənib, müqəddəs, Böyük Məhəmməd peyğəmbər bu mühüm müqaviləni imzalamaqla onu qüvvətləndirmişdir.

Allah böyükdür və fövqəltəbiidir!

Allahın seçdiyi Böyük elçi Məhəmməd peyğəmbərin (Allahın nəzər-duası onun və nəslinin üstündədir!) buyruğuyla bu müqavilə Hicrətin dördüncü ilinin ilk dörd ayından sonra bədr gecəsində tərtib edilmişdir.

# FƏSİL 3

# MƏHƏMMƏD PEYĞƏMBƏRİN NACRAN XRİSTİANLARI VƏ TƏRİQƏTLƏRİNƏ DAİR MÜHAFİZƏ FƏRMANI

Mərhəmətli, Rəhmli Allahın adı ilə!

Mühafizə Fərmanı xristianlar və xristian məzhəbindən olan xalqlara Allah və onun elçisi Məhəmməd peyğəmbər s.ə.s. tərəfindən göndərilmişdir.

Giriş

Allahın elçisi Məhəmməd peyğəmbər *s.ə.s.* tərəfindən bütün bəşəriyyət üçün yazılmış himayə və mühafizə fərmanını müsəlmanlar daha yaxşı bilməli, həmçinin sonrakı nəsillər bu sənədin həqiqiliyinə inanmalı, öz xeyirlərinə istifadə edib, qorumalıdırlar.

İstənilən adama – istər qubernator olsun, istərsə də hakim, bu fərmanı dəyişmək, yaxud ona toxunmaq qadağandır.

Dindarlar bu sənədə daxil edilən məsələlərə heç bir şərtsiz əməl etməlidirlər.

Bu fərmanı kim qoruyursa, deməli, ona hörmətlə yanaşır, onun buyurduqlarına itaət və Allahın elçisinin vəsiyyətlərinə əməl etmiş olur.

Kim onun şərtlərini pozarsa, ona qarşı çıxıb üzüdönüklük göstərərsə, həmin şəxs Allahın vəsiyyətinə əməl etməyən, ona dönük çıxan, onun böyüklüyünü, qüdrətini danan, Allahın elçisinin iradəsinə tabe olmayan cinayətkar hesab olunacaq. Allahın nəzərində, ona asi olan, özünü Allah sayan bəndə kimi qalacaq.

Bu sənəd Allahın dinində himayəçilik və mühafizənin vacibliyini sənəd təsdiq edir.

Kim bu vəsiyyətə əməl etməsə, öz müqəddəs borcunu yerinə yetirməsə, Allahın qəzəbinə tuş gələcək, eləcə də dindarlar tərəfindən rədd ediləcək.

Xristianlar böyük etimad qazandıqları üçün böyük Allah, onun elçisi Məhəmməd *s.ə.s.* və möminləri, onları bu Mühafizə Fərmanına layiq bilmişlər.

Buna görə də hər bir müsəlman bilməyə borcludur ki, bu vəsiyyət, bizim xeyrimizə din ərənlərimizin qoyub getdiyi bir mirasdır ki, onu qorumağı, əbədi yaşatmağı, ona əməl etməyi qarşımıza bir vəzifə olaraq qoyur.

Həqiqətən qədim dinə və dini kitablara etiqad edən insanlar Allaha və Böyük Allahın təntənə ilə peyğəmbər elan etdiyi Məhəmmədə qarşı ədavət, kin və qəzəb nümayiş etdirir, Peyğəmbərin məramını inkar etməklə insanları onların hər ikisindən üz döndərməyə təşrik edirdilər. Bu, onların gizli yalan və fırıldaqçı niyyətlərindən, daşürəkli olmalarından xəbər verir. Onlar özləri bilərəkdən ağır cinayət yükünü öz boyunlarına götürərək, Allahın buyurduqlarını qəbul etmir, hamıdan gizli saxlayır, onlara şəhadət gətirmir və inkar edirdilər.

Bu adamlar, dinin onların üzərinə qoyduğu vəzifə borclarına boyun əymir, yerinə yetirməli olduqları nəsnələrə əməl etmir, Allaha və onun elçisinə qarşı qərəzli düşmənçilik hissiylə yaşayır, hiylə və yalanla insanları çaşdıraraq, onları inandırmağa çalışırdılar ki, Allah heç vaxt adamlar arasında təbliğat aparmaq, ona itaət edənlərə nurlu çıraq ilə xidmət göstərib cənnətə göndərmək, boyun əyməyənləri isə cəhənnəm əzabları ilə qorxutmaq üçün öz elçisini göndərə bilməz.

Onlar bu qarşıdurmanı o yerə çatdırdılar ki, başqalarını, özlərinin heç vaxt cürət edə bilmədikləri işlərə - Allahın Vəhylərini, peyğəmbərin xoş məramını hiyləgərliklə rədd etməyə təhrik edirdilər. Bunu ona görə edirdilər ki, o (peyğəmbər), sualtı daşlara ilişib irəli gedə bilməsin.

Allahın elçisiylə düşmənçilik aparmaqda onların məqsədi peyğəmbəri öldürmək idi.

Onlar bu məqsədlə qüreyş tayfalarından olan çoxallahlılardan bir dəstə topladılar ki, bu adamlar Məhəmməd peyğəmbərə (s.a.s) qarşı vuruşsunlar, onun təlimini mühakimə etsinlər, onun əleyhinə çıxmaqla, geri çəkilməsinə nail olsunlar.

Bu səbəbdən onlar Allahın himayəsindən, şəfaətindən kənarda qalmağa layiqdirlər. Onların xunayna günlərində, Banu Qaynuqun, Qüreyşə ilə Nadir tayfalarına qarşı mübarizədə özlərini necə apardıqları hamıya yaxşı bəllidir.

Onların başçıları Məkkə sakinlərinə, Allahın və Allahın elçisinin düşmənlərinə dəstək oldular. Düşmənləri döyüşçü ilə təmin edərək, peyğəmbərin üzərinə silahla getdilər.

Məhz xristianlar bu müharibəyə qarşı çıxaraq, Allaha və onun elçisinə itaət göstərdilər. Allahın özü onların müsəlman dininə və müsəlmanlara olan səmimi münasibətini yüksək qiymətləndirdi.

Allah yəhudilərin ürəklərinin məkrli və mərhəmətsiz olduğunu gördükdən sonra, öz Kitabında (Quran), eləcə də vəhyində xristianların müsəlmanlara sevgisini, sadiqliyini qeyd edərək, onların ünvanına tərifli sözlər söyləmişdir: Əlbəttə siz yəhudilər və çoxallahlılar içində ən qəddar düşmənlər görəcəksiniz, amma eyni zamanda onların arasında "Biz xristianlarıq" deyən və müsəlmanlara dəstək olanların dostluğuna da nail

olacaqsınız. Çünki onların içində lovğalıq etməyib Allaha və peyğəmbərinə sitayiş edən keşiş və rahiblər var. Və onlar peyğəmbərin ağzından Allah kəlamlarını eşidəndə gözləri yaşla dolur və bu həqiqəti ürəkdən qəbul edirlər. Onlar belə deyirlər: “İlahi, biz də elə bu cür düşünür və bu həqiqətə şəhadət veririk”. Əgər Allahın həqiqətləri gəlib bizə çatıbsa, biz nə üçün ona və onun həqiqətinin səmimiyyətinə inanmayaq? Biz ümid edirik ki, Allahın kəramətiylə ürəyi saf, xeyirxah, əməli saleh adamların cərgəsində yer alacağıq.

Doğrudan da, etibar qazanmış bəzi xristianlar Allahın bu müqəddəs diniylə tanış olduqları üçün, bizə bu dinin təntənəli şəkildə elan edilməsində yardımçı oldular və Allaha söykənərək, onun elçisi olan peyğəmbərə öz iradəsinə uyğun vaizlik etmək və öz məramını yerinə yetirmək imkanı verdilər.

Hicrin oğlu Səid Absiso, rahib İbrahim və keşiş İsa qırx atlının müşayiətiylə Nacrandan mənim yanıma o kəslərlə gəlmişdilər ki, həmin adamlar da elə onlar kimi xristian dininin Ərəbistan torpaqları və digər ölkələrdə yayılmasına xidmət edirdilər. Mən onlara öz məramım haqqında məlumat verərək, bu dinin yayılması və möhkəmlənməsində mənə kömək etmələrini xahiş etdim.

Onlar Allahın böyüklüyü və buyurduqlarının müqəddəsliyini öz gözləriylə gördükdən, duyduqdan sonra, məndən üz döndərmədilər, bir addım belə geri çəkilmədilər.

Əksinə, bu işdə mənə qoşulub, bu birliyin möhkəmliyini təmin edərək, mənim gördüyüm işə öz razılıqlarını verməklə yardım etdilər. Mərhəmətli vədlər, yaxşı məsləhətlər verdilər, öz andları və vədləriylə məni əmin etdilər ki, mənim gətirdiyim həqiqəti dəstəkləyəcək, Allahın istəyinə qarşı çıxanları rədd edəcəklər.

Öz dindaşlarının yanına qayıtdıqdan sonra onlar öz vədlərinə xilaf çıxmadan əqidələrinə sadiq qaldılar. Mənə verdikləri vədlərin hamısına əməl etdilər, onlar məni tərk etdikdən sonra anladım və məmnun oldum ki, bu adamlar yəhudilərə qarşı vuruşda mənimlə birlik nümayiş etdirməklə öz sadiqliklərini ortaya qoydular.

Onlar Allah yolunu seçən adamları toplayaraq ümumi razılıq əldə etdikdən sonra dini təbliğ etməyə, onu və onun daşıyıcıları olan möminləri qorumağa çalışdılar. Yəhudilərin məni inkar etmək və məramıma qarşı çıxmaq üçün gətirdikləri dəlil və sübutları lağa qoyub, onları ələ saldılar. Xristianlar mənim fəaliyyətimə dəstək olaraq, təlimimə qarşı çıxanları, onu təkzib və təhrif edənləri, ümumiyyətlə, rədd edənləri döyüşə çağırırdılar.

Dünyanın müxtəlif guşələrindən bütün ərəb hakimləri, görkəmli müsəlmanlar və istedadlı adamlar, xristianların mənim məramıma olan sevgisinə, onların öz ölkələrinin hüdudlarından kənara çıxaraq, sərhədləri

aşıb keçmək cəhdlərinə, müqaviləyə əməl etməyə qərar vermələrinə, onlarla görüşdüyüm zaman təqdim etdiyim sənədə keşiş və zahidlərin sarsılmaz sadiqliyinə dair məktublar göndərmişdilər.

Mən öz məramımın yayılmasını istəyirəm. Təlimimdə əks olunan baxışlarımı, məqsədimi inkar edən, onlarda qüsurlar axtarıb məhv etmək istəyən, aşağılamağa çalışan adamlara qarşı mübarizədə mənimlə bərabər olmanızı xahiş edirəm.

Onlar mənim təlimatıma uyğun hərəkət edirdilər. Çalışırdılar ki, Həqiqəti tanıyıb, ona boyun əysinlər, Allahın çağırışına cavab versinlər, dəxli yoxdur könüllü şəkildə, yaxud ehtiyac ucundan İslamı qəbul etmiş olsun, əsas odur ki, bu dinə sitayiş etsinlər.

Xristianlar mənimlə onlar arasında bağlanmış müqavilənin şərtlərinə əməl edərək, elə fəaliyyət göstərirdilər ki, bu yoldan sapmasınlar, öz vəzifə borclarını yerinə yetirsinlər, məramımın həyata keçirilməsiylə bağlı verdikləri vədə sadiq qalsınlar.

Dinə öz sadiqlikləriylə xristianlar yəhudilər, qüreyşlilər və digər çoxallahlılardan seçilirdilər.

Onlar dünya varına həris deyildilər. Yəhudilər kimi puldan ötrü sələmçiliklə məşğul olub, Allahın Qanunlarını çox ucuz qiymətə satmırdılar. Belə mənfəət əldə edənlər bəlasına çatsın, onlara haqq qazandıranların da Allah bəlasını versin, belə üsullarla varlananlar bəlaya düçar olsunlar.

Mənə qarşı sərt, qəddar, aramsız mübarizədə düşmənlərimə dəstək verdiklərinə, əleyhimə danışdıqlarına, Allaha və onun rəsuluna xilaf çıxıb, məkrli planlar cızdıqlarına görə yəhudilər, qüreyş xalqından olan çoxallahlılar və digərləri Allahın və peyğəmbərin düşmənləri sayılmağa layiqdirlər. Buna görə də onlar Allahın, onun rəsulunun və bütün möminlərin düşməninə çevriliblər.

Xristianlar özlərini açıq-aşkar onlara müxalif kimi aparırdılar. Onlar mənimlə bağladıqları ittifaqa hörmətlə yanaşırdılar. Mənim hüquqlarımı tanıyırdılar. Onlar verdikləri vədlərə əməl edirdilər. Mənim müxtəlif yerlərə göndərdiyim xəfiyyələrə kömək edirdilər.

Onlarla müqavilə bağladığım məqamlarda, daxili səbəblərdən doğan əlavə öhdəlikləri belə, mən həm Şərq, həm də Qərbdə yaşayan müsəlmanlar adından təqdim edəndə vicdanla yerinə yetirdiklərinə görə mənim etimadıma, dostluğuma və onlara bağlılığıma layiqdirlər.

Onlar mənim himayədarlığıma layiqdirlər.

Onlar mənim himayədarlığıma həm mənim sağlığımda, həm də məndən sonra etibar edə bilərlər, inşallah!

İslamın yayılması, eləcə də mənim dinim və məramımın doğruluğu baxımından bu Saziş bütün müsəlman möminləri üçün vacibdir. Nə qədər ki, okeanın dibinə su çatır, göydən yağış tökülür, torpaq məhsul yetişdirir,

asimanda ulduzlar işıq saçır və dan yeri sökülüb, hər səhər zəvvarı qarşılayır, heç kəsə icazə verilmir ki, bu müqaviləni pozsun, ona dəyişiklik etsin, nələrisə çıxarsın, yaxud əlavə etsin, çünki belə dəyişikliklər mənim vəsiyyət və hamiliyimə xələl gətirir, onun gücünü zəiflədir.

Özümün tərtib etdiyim bu saziş mənim üçün də vacibdir. Mənim hümmətimdən kimsə məndən sonra özündə cəsarət tapıb bu Müqaviləni pozsa o, böyük və mərhəmətli Allahın Haqq divanında, onun varlığının sübutunu görəcək və orada heç bir şahidə ehtiyac olmayacaq.

Məni bu cür addım atmağa məcbur edən nədir? Seyid Hassanidən üç nəfər məndən xahiş etdi onlara elə bir sənəd verim ki, bu sənəd onların mühafizəsinə xidmət etsin. Belə ki, bu sənəd, onların vədlərə sadiqliyi, müsəlmanlara verdikləri vədləri yerinə yetirdikləri və onlarla bağladığım könüllü razılaşmanın doğruluğunu təsdiqləsin.

Mən istəyirdim müttəfiqlik razılaşmalarının müddəaları, ərəb bölgəsində mənim bütün ardıcıllarımın gözü qarşısında təsdiq edilsin: mən və mənim çağırışıma gələnlərin borcu idi ki, özünü xristian adlandıran, həmçinin müxtəlif xristian məzhəblərindən olan adamlardan inciklikləri olarsa, ona təmkinlə yanaşsınlar və onlarla bağladığım sazişin sarsılmazlığını, vacibliyini bütün müsəlmanlar dərk etsinlər.

Buna görə bütün müsəlman rəhbərlərini və öz yaxın silahdaşlarımı dəvət edib, özüm də xristianların tələblərinin yerinə yetirilməsinə zamin duraraq, bu sənədi hazırladım. Müsəlmanlar hakim, yaxud məzlum olmalarından asılı olmayaraq, bu sənədi nəsildən-nəslə ötürməyə, məndən bu sənədi istəyənlərə hörmət və sədaqət əlaməti olaraq vədlərə əməl etməyə borcludurlar.

Mən bu məsuliyyəti ona görə müqaviləylə öz üzərimə götürdüm ki, mənim buyruğumu eşitməyən bir kimsə məzəmmətə düçar olmasın.

Xalq həmçinin onlara (xristianlara) zərər verməkdən çəkinməli, aramızda bağlanan müqaviləyə ehtiramla yanaşmalıdır. Çünki onlar istənilən məqamda həqiqətin düşmənlərinə qarşı mübarizədə mənimlə bərabər olacaq, onlar üçün elədiklərimə öz töhfələrini əlavə edəcəklər. Mənim məramımı qorumaq yolunda hər cür nifrət və pisliklərə dözən hər bir xristian buna layiqdir.

Müsəlmanlar arasında bu müqaviləni pozmaq, ondan kənara çıxmaq halları istisnadır, hətta onlar bu sənədin müddəalarına qarşı çıxmsalar, onlara verdiyim hüquqları tanımaq iqtidarında olmasalar belə, bu yoldan sapmağa haqları yoxdur.

Nəhayət, bu müqavilə möminləri xeyirxah olmağa səsləyir, xoşməramlılığa ruhlandırır və bunun müqabilində onları mükafatlandırır, Şərdən uzaqlaşdırır. Bu yol Həqiqət yoludur, Allahın iradəsiylə Haqq Divanına gedən yoldur.

# NACRAN XRİSTİANLARI İLƏ PEYĞƏMBƏRİN BAĞLADIĞI MÜQAVİLƏ

Mərhəmətli, Rəhmli Allahın adı ilə!

Bu sənəd Abdullah Abdul Mütəllib oğlunun oğlu Məhəmməd *s.ə.s.* - Allahın rəsulu tərəfindən bəşəriyyətə bəxş edilən bir hədiyyədir ki, onu Yaradan etimad göstərdiyi bəndələri üçün təlimatlanmaq və xəbərdar olmaq məqsədilə göndərmişdir. Belə ki, Allahın əvvəlki elçilərindən sonra belə əzəmətli və müdrik varlığın - peyğəmbərin meydana çıxması ilə adamların Allaha şikayət etməsi üçün əlyeri qalmayacaq.

Kəaba oğlu Xarisin oğlu Seyidə, onun məsləkdaşlarına, xristian dinini təqib edən, istər Şərqdə, istər Qərbdə, istər yaxında, istər uzaqda, istər ərəb, istər əcnəbi, istər məlum, istər naməlum olsun, fərq etməz, hər kəs üçün bu sənəd qarşılıqlı razılaşma və ədalət əsasında hazırlanmış güclü, həqiqi, sarsılmaz Müqavilədir.

Kim bu fərmanın müddəalarına tabe olacaqsa, o özünün İslama bağlılığını sübut etmiş olacaq və İslamın ona verə biləcəyi ən yaxşı mükafata layiq görüləcəkdir. Əksinə, istənilən kəs, onda əksini tapmış vədləri yox saysa, dəyişsə, mənim mühafizəçilərimə tabe olmasa, həmin adam bizim xristianlarla müttəfiqliyimizə nifrətini göstərmiş və bu ittifaqı, hətta Allahın özüylə müqaviləni pozmuş olacaq. O, kim olursa olsun, nifrətə layiq görüləcək.

Mən Allahın izniylə müttəfiqlik öhdəliyini öz üzərimə götürür və onun doğruluğuna and içirəm. Allahın peyğəmbərləri, seçdikləri müqəddəsləri, bütün müsəlmanlar və möminlər adından zəmanət verirəm. Mənim müttəfiqliyim və razılaşmam belədir.

Mən bir daha Allahın İsrail uşaqları üzərinə qoyduğu öhdəlikləri elan edirəm ki, ona itaət edib, qoyduğu qanuna əməl etsinlər, onun ilahi müttəfiqliyinə hörmətlə yanaşsınlar. Mən hamıya elan edirəm: xristianların istər mənim müstəmləkəmlə sərhədyanı ərazidə, istər digər məkanda, uzaq və yaxında olmasından asılı olmayaraq, sülh zamanı olduğu kimi, müharibə məqamında da mənim atlılarım, piyadalarım, döyüşçülərim, könüllülərdən ibarət qoşunlarım onların müdafiəsində duracaq.

Mən, bir vəzifəm olaraq, onları dəstəkləyir, nəinki özlərinin, həm də onların böyük və kiçik kilsələrinin, dua evlərinin, rahiblər üçün nəzərdə tutulan monastrların, zahidlərin sığınacaqlarının – harda - dağlarda, mağaralarda, düzənlikdə, səhrada, kəndlərdə, şəşərlərdə yerləşməsindən asılı olmayaraq, müdafiəsini və himayəsini boynuma götürürəm.

Onların dini və kilsələri, harda – quruda, yoxsa dənizlərin ortasında, Qərbdə, yoxsa Şərqdə yerləşməsindən asılı olmayaraq sonsuz sayıqlıqla

həm mən, həm də ailəm və ümumilikdə bütün müsəlmanlar tərəfindən mühafizə olunacaq.

Onları öz himayəmə götürürəm. Onlarla saziş bağlamışam. Ona görə də onları istənilən pislik və zərbədən, ziyandan qorumalı, hansısa vergidən, məşəqqətli, ağır borcdan azad etməliyəm. Mən onları köməkçilərim, davamçılarım və xalqımın köməyilə bizə qarşı çıxan düşmənlərdən qoruyacağam.

Onlar mənim hakimiyyətim altında yaşadıqları üçün hər cür hücumdan qorunmalıdırlar. İslam uğrunda mənimlə bərabər döyüşən məsləkdaşlarımı qada-baladan necə qoruyuramsa, onları da eləcə mühafizə etməliyəm.

Mən bütün din cəngavərlərinə yığım vaxtı onlara qarşı zor tətbiq etməyi qadağan edirəm. Əgər özləri könüllü olaraq vergi verməkdən boyun qaçırsalar belə, onlara məcburiyyət yoxdur. Bir xristian belə qəddarlıq və istismara məruz qalmamalıdır.

Bir keşiş belə öz keşiş rütbəsindən, bir monarx öz rahib ordenindən, bir zahid öz mənəvi həyatından uzaqlaşdırıla biıməz.

Xristian kilsələrinin heç bir hissəsini dağıtmaq, oradan sahə qoparmaq, həmin sahədə müsəlman məscidi yaxud müsəlman üçün ev tikmək olmaz. Bu qanunları pozan hər kəs Allahın Müqaviləsini pozmuş olur, onun rəsulunu eşitmədiyi üçün İlahi müttəfiqlikdən məhrum edilir.

Əynində yun parçadan dindar paltarı gəzdirən heç bir rahib, zahid və keşişdən, əgər dağlarda, səhralarda tənha evsiz-eşiksiz yaşayırsa, can vergisi, eləcə də digər vergilər alınmamalıdır.

Rahib, zahid, ümumiyyətlə, bütün xristianlar üçün vergi həddi ildə dörd dirhəm olsun. Əks halda, hər hansı parçadan bir hissə, yaxud Yəmən əmmaməsi verə bilərlər. Bu müsəlmanların dövlət xəzinəsinə yardımı kimi qəbul olunar. Əgər ona da gücləri çatmasa, onda həmin dəyərdə, könüllü olmaqla, başqa bir vergi haqqı ödəyə bilərlər.

Qoy can vergisini gəliri, torpağı, quruda yaxud dənizdə iri ticarəti, qızıl, qaş-daş və gümüş mədənləri olan varlı xristianlar ödəsin. Bu məbləğ ildə 12 dirhəmi aşmamalı və onların bu ölkənin vətəndaşı olması və burada yaşaması nəzərə alınmalıdır.

Bu ölkənin vətəndaşı olmayan və hansı ölkənin vətəndaşı olduğu bəlli olmayanlar və səyyahlardan heç bir vergi alınmamalıdır.

Özünün şəxsi miras mülkü olan şəxdən digər vətəndaşlardan alınan vergi qədər torpaq və can vergisi almaq olmaz. Torpağı olan digər vətəndaşlar isə torpaq və can vergisi ödəməlidirlər. Eyni zamanda onların ödədiyi vergi imkanları xaricində olmamalıdır. O ki qaldı işçi qüvvəsinə, icarədar onları ona görə icarəyə götürür ki, torpağı şumlasınlar, onu məhsuldar edib, yaxşı məhsul götürsünlər.

Götürülən artıq məhsula görə onlardan vergi tutulmamalıdır. Başqa hadisələrlə bağlı nə qədər vergi ödənilirsə, ona da elə o qədər vergi qoyulmalıdır.

Bizim ittifaqa daxil olan kişi xristian, müsəlmanların öz düşmənlərinə qarşı apardığı müharibədə iştirak etməməlidir. Həqiqətən onlar İttifaqın üzvü olaraq, müharibədə iştirak etməyəcəklər.

Bu müqavilə onlara elə bunun üçün verilib ki, müharibədən azad edilsinlər və müsəlmanların onlara hər cür yardımı təmin olunsun.

Dindarlar öz düşmənlərinə qarşı mübarizə apardığı məqamlarda, bir xristian belə özü könüllü şəkildə kömək etmək istəməsə, hətta bir müsəlmana pulla, silahla, atla yardım göstərməyə borclu deyil. Lakin bizə könüllü hərbi köməklik göstərən xristianlar isə ən yüksək tərifə, təşəkkürə və təltifə layiq olacaq, onun yardımı heç zaman unudulmayacaq.

Bir xristian belə zorla müsəlmanlığı qəbul etməyə məcbur edilməyəcək. Heç kəs digər dini kitabları oxuyan və onlara inanan adamlarla mübahisəyə girməməlidir, əlbəttə əgər bu, ümumi mənafeyə xidmət edirsə.

Onlar hansı ölkədə olurlarsa olsunlar, müsəlmanın mərhəmət qanadları onların üstünə çəkilməli, hər cür pislikdən və xəta-bəladan qorunmalıdırlar.

Əgər hər hansı xristian cinayət işlədib qanunu pozarsa, müsəlmanlar ona kömək etməyə borcludurlar. Ona mərhəmət göstərərək, işlədiyi cinayətə mümkün olduğu qədər güzəştlə yanaşmalı, zərərçəkəni təltifləndirib cinayətkarla barışdırmağa çalışmalıdırlar. Zərərçəkəni, onu incidən adamı bağışlamağa inandırmaq və əvəzində müavinət vermək gərəkdir.

Müsəlmanlar xristianları özlərindən ayrı salmamalı, onlara etinasızlıq göstərib, himayəsiz və köməksiz qoymamalıdırlar. Nə qədər ki, Allahın izniylə mən onlarla müqavilə bağlamışam, buna müvafiq olaraq, bizə yaxşı və pis nə verilibsə, onlara da eynən o şəkildə verilib. Bu müqavilənin sayəsində onlara toxunulmazlıq hüququ verilib ki, bizim himayəmizdən istifadə edə bilərlər. İstənilən halda onların hüquqları qorunmalıdır. Belə olduqda onlar özlərinin xeyrini də, şərini də müsəlmanlarla bölüşəcəklər.

Xristianlar nigah məsələsində də arzu etmədikləri adamla ailə qurmağa sövq edilməməlidirlər. Xristian qızlarını alarkən onların valideynlərinin razılığı olmalıdır. Nişanı qaytararkən, yaxud nigahdan imtina edərkən qızın valideynləri zərər çəkməməlidir. Belə nigahlar onların iradəsinə zidd olmamalı, razılıq və xeyir-duaları əsasında bağlanmalıdır.

Əgər müsəlman xristian qadınını arvadlığa qəbul edirsə, onun xristian etiqadına hörmətlə yanaşmalıdır. O, öz dinini dəyişməzsə, kilsə

mürəbbiləriylə istənilən vaxt məsləhətləşməyə getmək istəyərsə, ona azadlıq verilməlidir.

Kim bu göstərişə əməl etməsə, arvadını öz dini əleyhinə çıxmağa məcbur etsə, istənilən halda, Allahın Müqaviləsini pozmuş adam sayılacaq.

Bir sözlə, bu Müqaviləyə qarşı çıxan hər kəs Allahsız, kafir hesab ediləcək.

Əgər xristianlar öz kilsə və monastrlarının bərpası, yaxud hər hansı dini məsələ ilə bağlı müsəlmanlara müraciət edərsə, onlara kömək və dəstək verilməlidir. Lakin bu iş təmənnalı şəkildə yox, Allahın rəsulunun Müqaviləsinə sədaqət naminə görülməlidir. Bunu Allaha və peyğəmbərə layiq bir iş, onların naminə cəfakeşlik və fədakarlıq kimi qiymətləndirmək lazımdır.

Müsəlmanlarla onların düşmənləri arasında müharibə olarsa, müsəlmanlar xristianlardan könüllü çapar kəşfiyyatçı, casus qismində və digər hərbi işlər üçün istifadə etməməlidirlər. Kim bu göstərişə əməl etməzsə, o, Allahın səlahiyyətlərinə şərik çıxmağa çalışan, Allaha və peyğəmbərə qarşı çıxan qiyamçı hesab olunaraq, onların müttəfiqliyindən azad ediləcək. Xristianlara münasibətdə Allah tərəfindən onların xeyrinə qəbul edilmiş və peyğəmbərin imzaladığı sazişdən kənar görüləcək bütün işlər qadağandır.

O (Allah), həmçinin xristianlar qarşısında şərt qoymuş və tələb etmişdir ki, onlar da bu göstərişlərə öz dinlərinin göstərişlərini yerinə yetirdikləri kimi əməl etməyə söz versinlər. Müharibə zamanı müsəlmanlara qarşı satqın və kəşfiyyatçı qismində vuruşmamaq həmçinin bu şərtlərimdən biridir.

Şərtlərimdən biri də budur ki, onlar müsəlman düşmənlərini öz evlərində gizlətməyə cürət etməsinlər, əks halda düşmən həmin yerdən müsəlmanlara qarşı hücuma keçə bilər.

Ümumiyyətlə, düşmənə imkan verilməsin ki, xristianların yaşadığı qəsəbələrdə, kəndlərdə, dua evlərində və başqa yerlərdə lövbər salsınlar. Xristianlar müharibə zamanı müsəlmanın düşməninə silah, at və döyüşçü ilə dəstək verməməli və düşmənlə yumşaq rəftar etməməlidirlər.

Onlar müsəlmanı üç gün, üç gecə atıyla bərabər gizlətməyə borcludurlar. Onlar harda yaşamalarından, hara getdiklərindən asılı olmayaraq, müsəlmana öz yedikləri yeməkdən təklif etməlidirlər. Lakin onlar məşəqqətli və qıcıq doğuran sıxıntılar içində yaşamağa borclu deyillər.

Əgər müsəlmana onlardan hansınınsa evində, yaxud dua evində gizlənmək lazım gələrsə, onlar qonaqpərvərlik göstərməli, kömək etməli, orada qaldığı müddətdə onu yeməklə təmin etməlidirlər. Onlar bütün

güclərini sərf etməlidirlər ki, müsəlmanın tələblərinə cavab verib, onu gizli yerdə saxlasınlar və düşmən əlinə verməsinlər.

Kim bu Müqaviləni pozsa, yaxud onun hər hansı bir şərtini dəyişsə, Allahın və onun elçisinin müttəfiqliyindən qovulacaq.

Qoy hər kəs rahiblərlə və eləcə də mənimlə bağlanan bu Müqavilə və digər sazişlərə əməl etsin, həmçinin əvvəlki peyğəmbərlərin də öz xalqlarının təhlükəsizliyini mühafizə etmək üçün müəyyənləşdirdiyi öhdəliklərdən bəhrələnsin.

Dünyanın sonuna qədər bu sənəddə olan müddəaları Allahın izni olmadan dəyişmək, yaxud pozmaq olmaz. Bu sənədi bəşəriyyətə Abdullahın oğlu Məhəmməd bağışlamışdır. Bu müqaviləni o, xristianlarla bağlamış və ora müəyyən şərtlər daxil edilmişdir. Şahidlər aşağıdakı şəxslərdir:

Abu Kuhaf oğlu Atik; Ömər əl-Xəttab oğlu; Osman Əffan oğlu; Əli Əbu Talıb oğlu; Əbu Zərr; Əbu əl Darda; Əbu Hürayra; Abdullah Məsud oğlu; Əl-Abbas Əbdal Mutallib oğlu; Əl-Fədl Əl-Abbas oğlu; Əl-Zübeyir əl-Avvam oğlu; Təlxoy Übeydəllah oğlu; Saad Müəzza oğlu; Saad Übeyd oğlu; Tumma Qeys oğlu; Zeyd Sabit oğlu və onun oğlu Abdəllah; Hürkus Züxeyr oğlu; Zeyd Ərkəm oğlu; Üsəma Zeyd oğlu; Ömər Məhsun oğlu; Musa Zübeyir oğlu; Əbu Əl-Əllah; Abdullah Əl-Əsa oğlunun oğlu Əmranın oğlu; Əbu Hüdheyfa oğlu; Kəəba Məlik oğlu; Həsən Sabit oğlu; Cəfər Əbu-Talib oğlu (Müaviyyə Süfyan oğlunun əliylə yazılmışdır)

# FƏSİL 4.

# MƏHƏMMƏD PEYĞƏMBƏRİN DÜNYA XRİSTİANLARINA VERDİYİ VƏDLƏR

(*Karmel dağları əlyazması*)

[*Məhəmməd peyğəmbərdən*]

[*Son Endryu Morrounun tərcüməsi, 2013-cü il*]

[*Rəhmli və Rəhman Allahın adıyla*]

Allahın elçisi olan Məhəmməd bu Sənədi bəşəriyyətə bəxş etməklə, onu dünyada yayır, təbliğ edir və insanları əsil həqiqəti tanımağa çaırır. Bu mənada onun Allahı müdafiə etməyə çox böyük haqqı var. Həqiqətən də Allah istər Qərbdə, istər Şərqdə, istər ərəb, istər qeyri-ərəb ölkələrində, istər yaxında, istər uzaqda, istər məlum, istər naməlum yerlərdə yaşayan xristianların və Xristian dininin böyük hamisidir.

Bu sənəd xristianlar üçün hazırlanıb, çox nüfuzlu vədnamə və hərtərəfli şəhadətnamə, eləcə də onlara hörmət etməyə səsləyən himayəedici vəsiyyətnamə xarakteri daşıyır. İslam dinini təbliğ edən, sırf onun içində olan kimsə əgər mənim bu sənəddə qeyri-müsəlmanlara göstərməli olduğumuz münasibət haqqında yazdıqlarıma qarşı çıxar yaxud onu inkar edərsə, deməli həmin şəxs Allaha və onun rəsulunun Müqaviləsinə qarşı çıxır, onların himayədarlını rədd edir, baxmayaraq ki, fərq etmir, o sultandır, ya adi dindar müsəlman.

Mən müttəfiqlik hüquqları və vəzifələrini məndən və mənim ailə üzvlərimdən istəyən müsəlmanlara, Allahın peyğəmbərlərinin, digər seçilmişlərin, müqəddəslərinin (müsəlman və qeyri-müsəlman kimliyindən asılı olmaayaraq!) bir nəfər kimi hamısının zəmanətiylə bu sənədi təqdim etməyə borcluyam.

Mənim fərmanım və vədlərim ən etibarlı və möhkəm fərmandır ki, onu Allah öz elçisinə, yaxud mələyinə (şəxsən Cəbrayıla) daşa çox yaxınlaşana bəxş etmişdir.

Mən onların hakimlərini, bizim möhkəmləndirilmiş sərhədyanı vilayətlərdə, öz atlarım, əyanlarım, köməkçilərim, hətta düşmən ərazisində olan dindaşlarımla birgə qorumaq iqtidarındayam. Onlar istər uzaqda olsun, istərsə də yaxında, istər müharibədə olsun, istərsə də əmin-amanlıqda, fərq etməz! – mən həmişə onların arxasındayam.

Mən onların kilsələrinin, ziyarət yerlərinin, - hazırda hardadırlar və haralarda ələ keçə bilərlərsə: dağlarda, səhralarda, mağaralarda, şəhərlərdə, kəndlərdə, bir sözlə, məskunlaşdıqları hara varsa orada! - dəxli yoxdur, təhlükəsizliklərinə təminat verirəm. İstər yer üzərində olsunlar, istərsə su altında, Qərbdə ya Şərqdə olsunlar, mən onların dinini və mülkiyyətini, eynən özümü, varislərimi, davamçılarımı, icmamın üzvlərini qoruduğum kimi himayə etməyə qadirəm.

Bütün pislik və hücumlardan müdafiə olunmaları üçün mən onları öz himayəmə götürür, istənilən vergidən və əziyyətli işlərdən azad edirəm.

Mən həmişə onların yanındayam. Bu işdə mənə davamçılarım, köməkçilərim və icmamın üzvləri yardım edəcəklər.

Mənim hakimiyyətim altında olduqları üçün onları elə idarə etməliyəm ki, özüm və mənim tərəfdarlarım heç bir şeydən əziyyət çəkməyib, nüfuzumuzu qoruduğumuz kimi, onlar da qayğısız, qada-balasız yaşasınlar.

Mən onları sövdələşmə və alverdən gələn hər cür zərərdən, ziyandan kənarlaşdırmalıyam ki, onlar torpaq xəracını ödəməkdən ötrü güzəşt kaızı almağa məcbur olmasınlar, yalnız istisna hallarda, əgər özləri bunu ödəməyə könüllü razılıq verərlərsə, bu məsələdə onlara məcburiyyət yoxdur.

Keşisi öz tutduğu vəzifəsindən, xristianı öz dinindən, rahibi öz hücrəsindən, zəvvarı öz ziyarətgahından, zahidi öz qalasından məhrum etmək yolverilməzdir. Onların kilsələrinin istənilən hissəsini dağıdıb, yerində müsəlman məcidi, yaxud müsəlmanlar üçün ev tikmək olmaz. Kim buna yol vermiş olarsa, demək o, Allahın vədini pozur, onun rəsulunun üzünə ağ olur, İlahi müttəfiqliyə dönük çıxır.

Rahiblərin və keşişlərin üzərinə can vergisi və eləcə də digər vergi növləri qoymaq olmaz, bu yalnız onların özünün istəyi ilə mümkün ola bilər.

Can vergisi iri müəssisə sahibləri, qəvvaslar (mirvari axtaranlar), qiymətli daş-qaş yataqları olanlar üçün, vergi həddi ildə on iki dirhəmi aşmamalıdır.

Bu deyilənlər ölkənin daimi və müvəqqəti sakinlərinə şamil edilir, səyyahlara isə aidiyyəti yoxdur.

Səyyahlar, yaxud yaşayış yerləri məlum olmayanlar, torpaq vergisi və can vergisi ödəməyə borclu deyillər, çünki onlar torpağı irsən almayıblar və ona haqqı çatmır. Həmin pulu başqaları ödəməlidir və vergi həddi onun imkanları xaricində olmamalıdır.

O ki qaldı torpağını məhsuldar edib, artıq məhsul əldə etmək istəyən sahibkarlara, onlar bunun üçün muzdlu kəndlilər cəlb edib, yaxşı məhsul götürməyə nail ola bilərlərsə, onları əldə etdikləri artıq məhsula görə vergi

verməyə məcbur etmək olmaz. Qoy onlar vergini digər gəlir mənbələri hesabına ödəsinlər.

Müsəlman olmayan azad insanlar Müsəlman Himayəçilik Fərmanına əsasən aparılan müharibələrdə iştirak etməməli, müsəlmanların düşmənlərinə hücum edib, döyüşə girməməlidirlər. Bu Fərman, məhz həmin müddəanın, eləcə də onlar üçün kömək və müdafiənin təmin olunmasına xidmət edir. Onlar müsəlmanlarla bərabər, düşmən qarşısına çıxmağa, onları atla, silahla təmin etməyə borclu deyillər. Əlbəttə, əgər özləri bunu könüllü etmək istəməsələr. Əgər kimsə buna özü könüllü getmək arzusunda olarsa, hörmət və nüfuz sahibi kimi qəbul ediləcək.

Heç bir xristiana müsəlman dini zorla qəbul etdirilməyəcək. Müsəlmanlar onlara öz köməklərini və himayələrini təklif etməlidirlər.

Cinayəti bağışlamaq və zərərçəkəni şirnikləndirmək lazımdır ki, onu incidən adamı əfv etsin. Müavinət verib, zərərçəkəni yola gətirmək, dilə tutub inandırmaq vacibdir.

Müsəlmanlar xristianlardan üz döndərməməli, onları köməksiz və müdafiəsiz qoymamalıdırlar. Mən onlara Allahın adından imtiyazlar vermişəm ki, başımıza gələn bütün yaxşı və pis işlərdə onlar da bizimlə bərabər olsunlar. Onlar, mənim imzaladıım Müqavilənin sayəsində bizim dəstəyimizdən istifadə etmək və toxunulmazlıq hüququ əldə ediblər. Belə ki, onlar öz talelərini bizim taleyimizə bağlayacaqlar.

Xristianlar arzuolunmaz nigahlarla bağlı da hər hansı zorakılığa məruz qalmamalıdırlar. Müsəlmanlar xristian qızları ilə, onların valideynlərinin izni olmadan nigaha girə bilməzlər. Bu cür nigahlar baş tutmazsa, həmin qızların ailəsi hər hansı təzyiq və işgəncə görməməlidirlər.

Əgər bir müsəlman xristian qadınını arvadlığa götürürsə, onun dininə və dini görüşlərinə hörmətlə yanaşmalıdır. O, öz qadınına, dini rəhbərləri ilə ünsiyyət qurmağa, istədiyi vaxt öz dini ayinlərini icra etməyə icazə verməlidir. Onu xristianlıqdan imtinaya məcbur etməməlidir. Kim bu qadağalara baxmayıb, qadınını öz dinindən dönməyə və başqa xoşagəlməz işlərə məcbur etmək üçün səy göstərsə, o, Allahın Vəd Fərmanını pozduğuna, Allaşın rəsulunun imzaladıı Müqaviləyə qarşı çıxdıına, Allaha və onun elçisi olan Məhəmmədə asi olduğuna görə günahlandırılaraq fırıldaqçı hesab ediləcək.

Əgər xristianlar yardım və dəstək üçün müsəlmanlara müraciət edərlərsə, onların kilsə və monastrlarının bərpasında, təşkilati məsələlərə icazə verilməsində, bir sözlə, bütün dini işlərdə onlara kömək göstərilməlidir. Eyni zamanda müsəlmanlar bunu hansısa mükafatı almaq naminə yox, Allahın Mühafizə Fərmanına ehtiram əlaməti olaraq etməyə borcludurlar. Bunu təmiz ürəklə Allaha və onun rəsuluna layiq bir xidmət

kimi yerinə yetirməlidirlər.

Müsəlmanlar öz düşmənləri ilə mübarizə apararkən xristianları könüllü şəkildə çapar, kəşfiyyatçı, xəfiyyə qismində vuruşa cəlb etməməlidirlər.

Kim xristianlarla belə rəftar etsə, özünü istismarçı kimi aparıb, Allahın iradəsinə qarşı çıxsa, onun və peyğəmbərin vəsiyyətini pozmuş olacaq.

Aşağıda Allahın rəsulu Məhəmmədin Xristian icması və bu dinlə bağlı dairələrin qarşısına qoyduğu şərtlər öz əksini tapıb. Xristianlar bu vəsiyyətnaməyə hörmətlə yanaşıb, ona ciddi əməl etməlidirlər ki, nəyə razılıq verdiklərini bilsinlər.

Belə ki, onlardan heç biri müharibə zamanı müsəlmana qarşı kəşfiyyatçı, xəfiyyə, çapar qismində vuruşa bilməz.

Düşməni öz evində gizlədə bilməz, çünki onlar bu evlərdə gizlənməklə fürsət anında müsəlmanlara qarşı hücuma başlaya bilərlər. Xristianlar, onların ərazilərində, kəndlərində, dua evlərində və məsləkdaşlarına məxsus yerlərdə düşmənə ev kirayələməyə imkan verməməlidirlər. Onlar düşmənə heç bir dəstək verməməli, onlara silah, at və adamla kömək göstərməməli, salam verib görüşməməlidirlər.

Xristianlar müsəlmanlara atlarıyla bərabər üç gün, üç gecə sığınacaq verməlidirlər. Onlar harda olurlarsa olsunlar, hara gedirlər getsinlər, öz yediklərindən müsəlmanlara da təklif etməlidirlər. Eyni zamanda onlar ağır çətinliklərə və onlarda qıcıq yaradan şeylərə dözməyə borclu deyillər.

Əgər müsəlman onlardan birinin evində yaxud dua evində gizlənərsə, onlar burda qaldığı müddətdə müsəlmanı yeməklə təmin etməli, güclərini səfərbər edib, onu gizlətməyə və düşmən əlinə verməməyə çalışmalıdırlar.

Kim bu müddəanı pozar və fərmanda göstərilənləri dəyişərsə, o, Allah və onun rəsulu Məhəmmədlə olan müttəfiqlikdən çıxarılacaq.

Qoy hər kəs - şahlar, rahiblər, dini kitab müəllifləri mənim özümlə bağladığımız Müqavilə və digər sənədlərdəki müddəalara əməl etsin. Hər bir peyğəmbər öz milləti üçün nəsə elədiyi kimi, mən də insanların etibarlı mühafizəsini təmin etmək üçün öz üzərimə bu öhdəlikləri götürmüşəm ki, bu da onların hərtərəfli müdafiəsində zəmanət rolu oynayır.

Bu fərmanım dünyanın sonuna, məhşər gününə kimi nə dəyişilə, nə də pozula bilər.

Allahın elçisi Məhəmməd tərəfindən bəşəriyyətə hədiyyə verilən bu fərman aşağıda adları çəkilən şahidlərin xahişiylə yazılmışdır:

*Əbu-Bəkr əl-Siddik; Xəttab oğlu Ömər; Osman Əffan oğlu; Əli Əbu-Talıb oğlu; Müaviyyə Süfyan oğlu; Əbu əl Darda; Əbu Zarr; Əbu Hurayra; Abdəllah Məsud oğlu; Abdəllah Əl-Abbas oğlu; Həmzə Abdal-Mutallib oğlu; Zeyd Sabit oğlu; Abd Allah Zeyd oğlu; Xarfus Zeyd oğlu;*

*Əl-Zübeyir Avvam oğlu; Saad Muaz oğlu; Sabit Qeys oğlu; Üsama Zeyd oğlu; Usman Matun oğlu; Abdullah Əmr əl-As oğlu; Əbu Rabiya; Hasan Sabit oğlu; Cəfər Əbu-Talib oğlu; Əl-Abbas oğlu; Talxoy Abd-Allah oğlu; Səad Ubad oğlu; Zeyd Arkam oğlu; Səhl Bayda oğlu; Daud Cubayra oğlu; Əbu əl-Əliya; Əbu Arifa; Usair oğlu; Haşima Asiyya oğlu; Zeyd Arkam oğlu; Əmmar Yasir oğlu; Kəəbə Malik oğlu; Kəəbə Kəəbə oğlu.*

*Qoy Allah onların hər birindən razı olsun!*

Fərman Əbu Sufiyan oğlu Müaviyyə tərəfindən Allahın rəsulu Məhəmmədin diktəsiylə Mədinəyə hicrətin dördüncü ilinin Rəbiyyül-Əşar ayının 2-ci günündə yazıya alınmışdır.

Bu sənəddə yazılanlara hər şeyə qadir olan Allah özü şəhadət verir.

Aləmlərin Allahına həmd olsun!

# FƏSİL 5

# MƏHƏMMƏD PEYĞƏMBƏRİN DÜNYA XRİSTİANLARINA VERDİYİ VƏDLƏR

(*Qahirə əlyazması*)

[*Con Endryu Morrounun tərcüməsi, 2013-cü il*]

Dünyanı xəlq etdikdən sonra əbədiyaşar Xaliqin, Yaradanın, Allahın adı ilə!

Bu, Abd-əl Mütəllib oğlu Abd-Allahın oğlu Məhəmməd tərəfindən bütün xristianlar üçün yazılmış Müqavilənin surətidir.

Müqavilənin surəti.

Bu vəsiyyətnamə Allahın rəsulu (Allahın xeyir-duası onun və ailəsinin üstündən əskik olmasın!) Məhəmməd Abd-Allah oğlunun əmriylə bütün xristianlar və rahiblərin mühafizəsi üçün bəşəriyyətə bəxş edilmişdir. Onlar Allahın xəlq etdiyi qiymətli varlıqlardan olduqları üçün bu sənəd onları qorumalı və müdafiəsini, eləcə də onların Allah və onun elçisi olan Məhəmməddən heç bir iddiası olmamasını təmin etməlidir.

O, bu himayəni özünün və Allahın nüfuzunun qorunması, Allahın aqil və hər şeyə qadir olduğunun sübutu kimi təqdim etmişdir.

Bu mühafizə Fərmanı, Şərq və Qərb ölkələrində yaşayan, ərəb, qeyri-ərəb olan bütün xristianlar üçün, Aslan güclü və onun kimi qabiliyyətli adamlar tərəfindən yazılmışdır.

Bu Fərman adətlərə hörmət və ədalət naminə verilmişdir.

Bu Vədlərə əməl edənlər, İslama da ləyaqətlə xidmət edəcəklər. Kim bu müqaviləni pozarsa, onun müddəalarını dəyişib, mövcudluğunu təhlükə altında qoyarsa, deməli, həmin şəxs kimliyindən asılı olmayaraq - istər əsilzadə olsun, istər sadə ruhani, fərqi yoxdur! - Allahın və onun elçisi olan Məhəmmədin imzaladıı Müqaviləni və içdiyi andlar pozur, öz dinini sevmir. Buna görə də o, Allahın lənətinə layiqdir.

Mən öz fəaliyyətimə Müqavilə bağlamaqla başladım. İttifaqa daxil olub, Vədləri məndən və bütün müsəlman icmalarından istəyənlərə verdim. Mən onlara Allahın Vəsiyyətlərini və Fərmanını onun bütün peyğəmbərlərinin, seçilmişlərinin, ən qədim dostları olan müsəlman müqəddəslərinin zəmanətiylə verdim. Mənim möhür basdığım təhlükəsizlik və himayədarlıq sənədi ən etibarlı Fərmandır ki, əzəmətli Allah onu əvvəllər peyğəmbərlərə əta etmişdir ki, insanlar tərəfindən bu müqavilənin ehtiramla qəbul və onun bütün müddəalarına əməl edilməsinə

nail olsunlar.

Allahın xristianlara vədi ondan ibarətdir ki, mən, yaxında ya uzaqda olmasından asılı olmayaraq, istənilən ölkədə yaşayan silahdaşlarımın köməyilə, öz hakimiyyətimdə olan adamlardan, atlardan, silahlardan və öz gücümdən istifadə etməklə, onların torpaqlarını, monastrlarını və ticarət obyektlərini mühafizə edim.

Mən onların ibadətgahlarının harada yerləşməsindən asılı olmayaraq, kilsələrinin, müəssisələrinin, məbədlərinin və rahiblərinin qorunmasına zəmanət verirəm.

Mən onların xüsusi statusunu, dinini, adət və ənənələrini, harada olmalarından asılı olmayaraq, müdafiə etməliyəm. Mən bunu özümü, öz müqəddəslərimi və icmamın üzvlərini qoruduğum şəkildə etməliyəm.

İstənilən anda mən onların himayə altına alınmasına, təhlükəsizliklərinin təminatına və bunu mənə etibar etmələrinə zəmanət verirəm.

Mən onları istənilən zərbə, ziyan və cəzadan qoruyuram. Onları istənilən düşməndən, ziyankar adamdan qorumaqla həmişə arxalarındayam. Onlar mənim güruhçularım olduqları üçün, mən həm öz maraqlarımı, həm də köməkçilərimin, davamçılarımın, icmamın üzvlərinin də maraqlarını bu yolda qurban vermişəm.

Mən öz qollarımı və qayğımı onların üstünə sərirəm, mənim borcum onları istənilən zərbədən qorumaqdır. Mənim məsləkdaşlarıma dəyməyən zərbə (onları müdafiə etməklə İslama kömək edənlər) xristianlara da dəyməməlidir.

Mən onların üzərindən ağır vergiləri götürürəm, buna könüllü şəkildə gedənlər istisna olmaqla. Onları buna məcbur etmək olmaz. Onlar haqsızlığa məruz qalmamalıdırlar.

Keşişi öz kilsəsindən, rahibi öz tərki-dünya həyat tərzindən, xristianı öz məzhəbindən, zahidi öz monastrından, zəvvarı öz ziyarətindən məhrum etmək yolverilməzdir. Onların kilsələrinin, yaxud müəssisələrinin istənilən hissəsini dağıdıb yerində məscid yaxud müsəlman dindarlar üçün ev tikmək olmaz.

Kim belə sapmalara yol verərsə, o, vəsiyyətnaməni pozmuş, Allahın elçisinin buyruğundan çıxmış və onun müttəfiqliyindən kənarlaşdırılmış hesab ediləcək.

Rahiblərə, keşişlərə, abidlərə, mömin olduğu üçün onlara məxsus yun paltar geyən, dağ yerlərində və digər monastrlarda yaşayanlara can vergisi, yaxud istənilən torpaq vergisi tətbiq edilməməliidr.

Can vergisi o xristianlardan tutulacaq ki, onlar ruhani deyillər, rahiblər və zəvvarlar istisna olmaqla, bu məbləğ bir ildə 4 dirhəm, yəni bir əbanın dəyərindən artıq olmamalıdır. Eyni zamanda pulu və yeməyi

olmayanlara müsəlmanlar dövlət xəzinəsindən yardım edəcəklər. Əgər onlar özlərini yeməklə təmin etmək iqtidarında deyillərsə, etiraz etmədikləri halda müsəlmanlar onlara kömək edərlər. Quruda və dənizdə iri ticarətlə məşğul olan – mirvari çıxaran, qiymətli daş-qaş yataqları olan, qızıl-gümüş istehsalçıları varlı xristianlar üçün müəyyən edilmiş torpaq vergisi bir ildə 12 dirhəmi aşmamalı və ölkədə daimi məskunlaşmış, eləcə də müvəqqəti yaşayan sakinlərdən tutulmalıdır.

Ölkənin daimi sakini olmayan səyyahlardan və yaşayış yeri bəlli olmayan yolçulardan heç bir vergi alınmamalıdır.

Öz qanuni torpaq mülkü olan adamlardan can vergisi və torpaq vergisi torpağı olan digər adamlardan alınan qədər alınmamalıdır.

Torpaq icarəyə götürənlər də vergiləri başqaları kimi ödəməli, lakin onlardan vergi alınarkən imkanından yuxarı hədd qoyulmamalıdır. O ki qaldı işçi qüvvəsinə, torpaq sahibi öz sahəsinin məhsuldarlığını artırmaq məqsədiylə becərmə işləri aparmaq üçün muzdlu kəndliləri icarəyə götürürlər. Ondan artıq götürülən məhsula görə əlavə vergi alınmamalıdır. Ədalətli olsun deyə vergi adi hallarda olduğu qaydada tətbiq edilməlidir.

Müsəlmanların üzərinə düşmənlər hücum etdiyi halda aparılan müharibəyə xristianlar getməyə borclu deyillər.

İmzaladığımız mühafizə fərmanı onları müharibədə iştirak etməkdən qoruyur. Onlara belə bir Vəd məhz bu öhdəlikdən azad edilmək üçün verilmişdir. Bu Müqavilə, müsəlmanların onları himayə etməsinə zəmanət verir. Müharibə zamanı müsəlmanlar düşmən üzərinə hücuma keçərlərsə, onlardan silah, at, hərbi sursat tələb etmək olmaz; bu, yalnız onlar könüllü yardım etmək istəyirlərsə mümkündür. Əgər müsəlmanlar müharibə aparmaq üçün xristianlardan nələrsə borc götürməli olsalar, dövlət xəzinəsi onların qaytarılması yaxud əvəzinin ödənilməsinə zəmanət verir. Xristianlardan kimsə müharibədə həlak olar, yaxud yaralanarsa, xəzinə onlara pul müavinəti ödəməlidir. Xristian dininə etiqad edən kimsə zorla islam dinini qəbul etməyə məcbur edilə bilməz.

Dini kitablarla bağlı ümumi mənafeyə xidmət etməyən məsələlərə dair onlarla hər hansı mübahisəyə girməyin.

Onlar mərhəmətimin qanadları altındadırlar, ona görə də istənilən yerdə onları qəzəb haqlasa, dərhal bunu dəf etmək lazımdır.

Əgər xristian hər hansı bir cinayət yaxud qanun pozuntusuna yol verərsə, müsəlmanlar ona yardım göstərməli, onları müdafiə və himayə etməlidirlər, onun yerinə cərimə ödəməlidirlər. Onunla qurbanı arasında barışığa nail olmaq üçün peşkəş verməlidirlər ki, bu bəladan qurtulsunlar.

Müsəlmanlar onları arxasız və köməksiz qoymamalıdırlar, çünki mən onlara Allahın bütün müsəlmanlar üçün vacib olan Vədini vermişəm.

Bu Müqavilənin gücüylə onlar bizim himayəmizdən istifadə etmək üçün toxunulmazlıq hüququ almışlar ki, buna görə də hər bir qəsddən qorunmalıdırlar.

Onları qəbul etməmək, yaxud rədd etmək olmaz, çünki onlar yaxşı gündə də, pis gündə də müsəlmanlarla bərabərdirlər.

Xristian qızları nigah məsələlərində incikliyə və xəyanətə məruz qalmamalıdırlar. Müsəlmanlar onlarla, valideynlərinin razılığı olmadan nigaha girə bilməzlər. Qızın valideynlərinin nişan taxma mərasimindən, yaxud nigahdan imtina etdiyi məqamlarda müsəlmanlar onları məcbur etməməlidirlər. Belə nigahlar onların arzusu, xeyir-duası, ortada dostluq münasibəti, mehribançılıq olmadan bağlanmamalıdır.

Əgər bir müsəlman hər hansı xristian qadınını arvadlığa qəbul edərsə, onun dini görüşlərinə hörmətlə yanaşmalıdır. O, öz dininə etiqadına davam etməlidir. Əgər o, öz dini rəhbərlərini dinləmək istəyərsə, ona bu məsələdə sərbəstlik verilməlidir. Hər kəs bu müddəanı pozsa və xristian arvadını öz dininə qarşı çıxmağa məcbur etsə, o, Allahın Müqaviləsinə dönük çıxan və qanunu pozan biri hesab olunacaq. Eyni zamanda Allaşın elçisinin buyruğunu eşitmədiyi üçün yalançı adlanacaq.

Əgər xristianlar öz məbədlərinin, monastrlarının bərpası, ümumiyyətlə, kilsə məsələlərinin həlliylə bağlı dəstək üçün sizə müraciət etsələr, onlara kömək və arxa olun. Lakin müsəlmanlar bunu onlardan hansısa mükafatı almaq niyyətiylə yox, özlərinin vəzifə borcları kimi yerinə yetirməlidirlər. Bunu Allahın elçisinin müqaviləsinə sədaqət göstərməklə etmək, xristian dininin bərpası naminə həyatını qurban verən adam kimi həyata keçirmək lazımdır.

O ki qaldı düşmənə qarşı aparılan müharibəyə, belə məqamlarda xristianları çapar, kəşfiyyatçı, yol göstərən qismində ordunun gücünü namayiş etdirmək məqsədilə könüllü döyüşçü kimi müharibəyə göndərmək olmaz. Kim bu məsələdə xristianları məcbur etməyə çalışarsa, o, Allaha itaətsizlik, onun elçisinə asilik göstərdiyinə görə dindən uzaqlaşdırılacaq.

Xristiana münasibətdə hər bir müsəlmana, Allahın elçisi, Abdullahın oğlu Məhəmməd tərəfindən xristian dininin mənafeyinə uyğun olan bu sənəddəki müddəalara əməl etməkdən başqa bir şey qalmaz.

Mən həmçinin xristianlara öz şərtlərimi təqdim və tələb edirəm ki, dinin şərtlərinə uyğun şəkildə onlara əməl etsinlər. Bu şərtlərdən biri də odur ki, müharibə zamanı xristianlardan heç biri düşmən tərəfindən müsəlmana qarşı kəşfiyyatçı, xəfiyyə, - gizli, və ya aşkar, fərqi yoxdur! - qismində vuruşmamalıdır. Heç bir xristian müsəlmanın düşmənini öz evində gizlədə bilməz, bu, istənilən anda düşmənin müsəlmana qarşı hücum etməsinə şərait yaradar. Həmçinin düşmənin, xristianların

məskunlaşdığı ərazilərə yaxın qəsəbə, kənd, dua evləri və onların məsləkdaşlarına məxsus yerlərdə qalmalarına yol verilməməlidir.

Onlar müsəlmanın silahlı düşmənlərinə heç bir şeylə – xüsusilə silah, at, adamla dəstək verməməlidirlər.

Eyni zamanda onlar bu şərtlərə əməl etdikləri dövrdə hər bir müsəlman onları qıcıqlandıracaq şərəkətlər etməməli, daim təmkin nümayiş etdirməlidir ki, öz dinlərinin və bu Fərmanın müddəalarını, şərtlərini yerinə yetirə bilsinlər. Onlar müsəlmanlardan bu vəzifələrin icrası üçün üç gün, üç gecə möhlət istəməlidirlər. Onlar harda olurlarsa olsunlar, hara gedirlərsə getsinlər, müsəlmana öz qida və ərzaqlarından təklif etməlidirlər. Lakin şeç bir xristian onda qıcıq doğuran davranışlara və ağır, məşəqqətli işlərə dözmək məcburiyyətində deyillər.

Əgər müsəlman onlardan hansı birininsə evində, yaxud dua evində gizlənməyə məcbur olarsa, o zaman onlar müsəlmana qonaqpərvərlik və qulluq göstərməli, orada olduğu müddətdə onu yemək-içməklə təmin etməli, düşmən əlinə keçməməsi üçün əllərindən gələni əsirgəməməlidirlər, bir sözlə, onun sağlamlığına və təlükəsizliyinə təminat verilməlidir.

Bu Fərmanın göstərişlərinə boyun əyməyən adam Allahın və onun elçisinin nəzərindən düşüb, müttəfiqlikdən kənarlaşdırılacaq.

Qoy hər kəs harda olmasına baxmayaraq, mənim ruhanilərlə bağladığım müqavilə və ittifaqın şərtlərinə əməl etsin.

Allahın rəsulu (onun üzərindən Allahın xeyir-duası əskilməsin!) öz arzusuyla müsəlmanlar adından bəşəriyyətə bəxş etdiyi bu Fərmana hörmət etməlidir ki, dünyanın Sonuna - Qiyamət gününə qədər o qorunsun və qəbul edilsin.

Kim xristianlara verilən bu imtiyazlara qarşı çıxıb, bu Fərmanı pozsa məhşər günündə mənim düşmənim olacaq. Allahın elçisi, Abd-əllahın oğlu Məhəmməd (Allahın xeyir-duası onun üzərindən əskik olmasın!) tərəfindən bütün xristianlar üçün yazılmış bu Fərmanda qoyulan şərtlərə aşağıda adları qeyd olunan otuz nəfər şəhadət verir:

Əbu-Bəkr əl-Siddik; Əl-Xəttab oğlu Ömər; Osman Əffan oğlu; Əli Əbu-Talıb oğlu; Əbu əl Darda; Əbu-Hürəyra; Abdəllah Məsud oğlu; Əl-Abbas Əl-Məlik oğlu; Fədl əl-Abbas əl-Zəkr oğlu; Təlx Abdəllah oğlu; Saad Müədda oğlu; Saad Übaday oğlu; Sabit Qeys oğlu; Yəzid Talit Übəday oğlu; Abdəllah Yəzid oğlu; Fərsus Kəzım oğlu; Bədr İbrahim oğlu; Ömər Yasir oğlu; Səhl Tamim oğlu; Abdəl-Əzim Nəccad oğlu; Əçdal Hüseyn Əzim oğlu;Abdullah Əl-Əsa oğlu Əmranın oğlu; Əmir Yasir oğlu; Müzzim Musa oğlu; Həsən Sabit oğlu; Əbu Hənifə; Übayid Mənsur oğlu; Həşim Abdəllah oğlu; Əbu-əl-Əzaq; Xişam Abdəl Mütəllib oğlu

Bu Fərmanı Əbu Talib oğlu Əli *(Allah ondan razı olsun!)* dəri üzərində yazmışdır və onun əlyazması Məhəmməd peyğəmbərin möhürüylə təsdiqlənərək, Sultanın himayəsində saxlanılır.

# FƏSİL 6

# MƏHƏMMƏD PEYĞƏMBƏRİN ASSURİYA XRİSTİANLARINA VERDİYİ VƏDLƏR

[*Tərcümə zamanı Core Devid Malexə istinad edilmişdir – 1910-cu il*]

Allah mənə nə etməli olduğumu dedi və mən onun göstərişinə əməl etməyə təntənəli şəkildə söz verirəm.

Mən İslamın bütün ardıcıllarına deyirəm: mənim göstərişlərimə əməl edin, Nəzəryanin xalqına bizim ölkədə və öz torpaqlarında kömək əli uzadın, onların müdafiəsini üzərinizə götürün.

Onların ibadətgahlarını rahat buraxın, harada olmalarından asılı olmayaraq yardıma ehtiyacları olarsa, əl tutun, onların keşişlərinə, müqəddəslərinə, rəislərinə kömək və təsir edin.

Miraslarına dəyməyin, evlərini və digər daşınmaz əmlaklarını, ümumiyyətlə, heç bir şeylərini dağıtmayın: İslam dininə etiqad edənlər bu icmanın üzvlərindən bir adamı belə narahat edə, ona ziyan vura bilməz, toxundurmazlar, çünki Nəzəryanilər mənim təbəələrimdir və mənə vergi ödəməklə müsəlmanlara kömək edirlər.

Şərt kəsdiyimiz kimi, bir vergidən əlavə onlar heç bir vergi ödəməyəcək, onların kilsə binaları olduğu kimi saxlanılacaq, dəyişilməyəcəklər. Keşişləri ibadət yollarını istədikləri şəkildə öyrədə bilərlər, çünki xristianlar öz dini məbədlərində və evlərində ibadət etməkdə azaddırlar.

Bir kilsə belə köçürülə, yaxud sökülüb materialları məscid tikilişində istifadə edilə bilməz. Bu yalnız Nəzəryanilərin könüllü razılığıyla mümkün ola bilər. Bu Fərmana kim itaət etməsə, o öz üzərində Allahın və onun elçisinin qəzəbini hiss edəcək. Nəzəryanilərdən toplanan vergi İslam təliminin tərəqqisinə xidmət etməli və qorunmaq üçün Beytulmal xəzinəsinə verilməlidir.

Adi adamlar cəmi bir dinar, tacirlər və daş-qaş yataqları olan varlılar on iki dinar vergi ödəməlidirlər. Gəlmələr və heç bir daşınmaz əmlakı olmayan şəxslər vergi ödəməməlidirlər. Əgər kimsə hər hansı miras əldə edibsə, o, təyin edilmiş məbləğdə Beyt-əl-məl dövlət xəzinəsinə vəsait köçürməlidir.

Xristianlar İslamın düşmənlərinə qarşı müharibə aparmağa borclu deyillər, lakin düşmən xristianlara hücum edərsə, müsəlmanlar onlara yardım etməkdən boyun qaçırmamalı, ehtiyacları olduğu təqdirdə onları at

və silahla təmin etməli, yadların qəzəbindən qorumalı və bizimlə dostluğa sadiq qalmalıdırlar.

Xristianlar İslam dininə keçməyə borclu deyillər, o vaxta qədər ki, Allah öz iradəsiylə onları mömin edər.

Müsəlmanlar xristian qadınları İslamı qəbul etməyə məcbur edə bilməzlər, lakin onlar özləri bu dini könüllü şəkildə qəbul etmək istəsələr, müsəlmanlar onlara qarşı lütfkar olmalıdırlar.

Əgər xristian qadını müsəlmana ərə gedib, lakin İslamı qəbul etmək istəmirsə, o öz kilsəsində ibadət etməkdə azaddır. Əri qadınının dini inancına görə ona qarşı bədxah olmamalıdır.

Bu şərtlərə tabe olmayan kəs deməli, Allaha və onun elçisinə də boyun əymir və böyük bir günaha batır.

Əgər Nəzəryanilər kilsə tikmək istəsələr, müsəlman qonşular dərhal onlara köməyə gəlməlidirlər. Bu ona görə belə olmalıdır ki, xristianlar bizi eşidib sülh və mərhəmət üçün yalvarmağa bizə gəliblər.

Əgər xristian kişiləri arasında seçilmiş şəxsiyyət, alim olarsa, müsəlmanlar onun böyüklüyünə qısqanclıqla yanaşmamalı, əksinə hörmət etməlidirlər.

Kimsə xristianlara qarşı kinli və ədalətsiz davranarsa, deməli, o, böyük bir günaha batıb və yeri Allahın elçisinə qarşı çıxanların arasıdır.

Xristianlar İslamın düşmənlərinə öz evlərində gizlənməyə yer verməməli, onlara at, silah və başqa şeylərlə yardım etməməlidir.

# KİTAB HAQQINDA TƏRİFƏ LAYİQ SÖZLƏR

Doktor Morrounun kitabı o qədər inandırıcıdır ki, müsəlmanlarla xristianları bir-birinə yaxınlaşdırmağa qabildir. Bu, əsil alim işidir və onun vaxtında dərc edilməsi çox önəmlidir. Onun məzmunu qarşılıqlı hörmət və din azadlığı hissləri tərbiyə edir. ***İmam Feysəl Abdul Rauf, "Kordova təşəbbüsü" təşkilatının sədri.***

Con Endryu Morrou yəhudi dini təliminin öyrənilməsinə özünün əvəzedilməz töhfəsini verdi. Öz kitabında o, Məhəmməd peyğəmbərin, müsəlmanlarla xristianların birləşməsi naminə səhra sakinlərinin qonaqpərvərlik və qarşılıqlı münasibət yaratmaq təcrübəsindən necə istifadə etdiyini nəql edir. Morrou peyğəmbərin vədlərindən birini sitat gətirir ki, o, bu gün də çox aktualdır: "Dini kitab yazan adamlarla ədavət və çəkişməyə yol verməк olmaz». ***Cozef Xobbs, Missuru Universiteti.***

Bu gün biz həmişə olduğundan daha çox anlayırıq ki, ya bacı-qardaş kimi birlikdə yaşamağı öyrənəcəyik, ya da biz hamımız dəlilər kimi öləcəyik. Məhəmməd Peyğəmbərin xristianlara ünvanlanmış bu məktubları müsəlman və xristianları əmin edə bilər ki, biz bir Allahın övladları olaraq, dost kimi, qonşu kimi, bizim bu kiçik planetin himayədarları kimi bir yerdə yaşamağa qadirik. ***Smid Safi, Şimali Karolina Universiteti***

Məhəmməd peyğəmbərin Vədləri haq-qında kitab, bütün müsəlman dünyasının mədəni və dini tarixi, eləcə də İslam və xristian dinləri arasındakı mədəni ilişkilərlə maraqlanan adamlar üçün gərəkli mənbədir. Bu kitab müxtəlif tərəqqili qütblər arasında xeyirxahlıq və tolerantlığın möhkəmlənməsinə, gələcəkdə aparılacaq tədqiqatlar qarşısında yeni üfüqlərin açılmasına kömək edəcəkdir. ***Aidə Qasımova, Bakı Dövlət Univetsiteti***

Doktor Morrounun özünün vəd etdiyi və ağır, məşəqqətli əziyyət bahasına incə, dəqiq metodla arayıb-ərsəyə gətirdiyi bu tədqiqat əsəri, yəqin ki, İslam mütəxəssisləri və tələbələrin böyük marağına səbəb olacaqdır. Həqiqətən, bu kitab məzmunca ibraniliyin üç qolu olan: xristian, iudaizm və islam dinləri arasındakı münasibətlərə yenidən baxılmasına cəsarətli bir çağırışdır. ***Amar Sellam, Məhəmməd Universiteti***

Doktor Con Endryu Morrounun bu işi, "Məhəmməd peyğəmbərin dünya xristianlarına Vədləri" maraqlı material olaraq, hər kəsin diqqətinə səbəb olur. ***Karen Lesli Ernandes, İslam haqqında***

Bu müqavilələrdə təqdim edilmiş müddəalar, peyğəmbərin dövrü üçün nə qədər mütərəqqi idisə, bu gün də öz aktuallığını saxlayır. ***Anna Mariya Martelli Afrika və Şərq ölkələri İtalyan İnstitutu***

Bu kitab ibranilik dininə məxsus xalqlarla peyğəmbərin bağladığı müqavilə və sazişlərilə-üçüncü islam mənbəyinin əsasını sənədlə müəyyən edir. Onun tərcüməsi peyğəmbər və onun silahdaşlarının həddən artıq tolerantlıq göstərərək, xristian və yəhudilərə hörmət və qayğıyla yanaşdığı nəticəsinə gəlməyə imkan verir. ***Bridcet Blomfild, Nebraski Universiteti***

Bu, vəsiyyətlər təkcə tarixi sənəd deyil: onlar bütün müsəlmanlara doğulandan ölənə qədər lazımdır və öz qüvvəsində qalır. Doktor Morrounun bu işi, İslam dininin hüquqlarının Beynəlxalq səviyyədə anlaşılması üçün yeni üfüqlər açır və bu vəsiyyətlərin gələcəkdə yeni elmi tədqiqatlarını aparmağı tələb edir. ***Xişam M.Ramadan, hüquq elmləri doktoru, Kvantlen Politexnik Universiteti***

Peyğəmbər Məhəmmədin vəsiyyətləri kitabı – dövrünün yenilik gətirən mükəmməl tədqiqat əsəridir. O, Məhəmməd peyğəmbərin siyasəti və düşüncələrinə işıq salır. ***Məhəmməd Elkuç, Məhəmməd Universiteti***

Bu, son dərəcə dəyərli elmi mirasdır: Məhəmməd peyğəmbərin vəsiyyətlərinin nəhayət ki, toplum halda ərsəyə çıxması əlçatan oldu. Bunlar onun dini irsinin ayrılmaz tərkib hissəsidir, xüsusilə ona görə ki, bunlar qeyri-müsəlmanlara, əsasən də xristianlara aiddir. ***Məhəmməd Rza Fəxr Ruhani, Qum şəhərinin Universiteti***

Doktor Morrou klassik ərəb dili və islamiyyəti mükəmməl bildiyi üçün, açıqca, çəkinmədən İslam dininə marağı olan bütün alimləri, insanlar arasında qarşılıqlı münasibət və anlaşmanı təqdir edən bir din üzərində düşünməyə çağırır. Onun kitabı, İslam haqqında həqiqəti axtaran hər bir qərəzsiz oxucunun kitab rəfində olmalıdır. ***Səid Mentak, Məhəmməd Universiteti***

Con Enryu Morrou bu kitabıyla balaca Kinq Martin Lüterin Birmenhem həbsxanasından yazdığı məktubla elədiyini etmişdir. O, bu məktubla oxucuları, oxuduqlarının məsuliyyətini dərk etməyə çağırmışdı. Bu məktub sanki bizə: "Budur vəsiyyətlər. Oxuyun onları! Oxuyun və peyğəmbərin niyyətinə hörmətlə yanaşın! – deyir. ***Barbara Kasselton, "Allahın ərəb və islam leksionu" kitabının ortaq müəllifi***

Əsil elmi tədqiqatın parlaq nümunəsidir. ***Kreyq Konsidayn, Hiffinqton Post.***

Məhəmməd peyğəmbərin zəmanəsində dünya xristianları ilə bağladığı Sazişlər haqqındakı bu əlçatandan və düşündürən kitab islamı hörmət və təmkin idealları üzərində dayanan bir din olaraq anlamağa inandırıcı şəhadət verir. **Dan Uilkinson, Pateos**

# Vəsiyyət Təşəbbüsü

Hazırda bütün dünyanı silkələyən, onu xarabazara çevirən, mütərəqqi yox, vəhşi bir qrupun törətdiklərinə cavab olaraq, müsəlmanlar qərara alıblar ki, "Məhəmməd peyğəmbərin xristianlara müqavilələri"nin dərc olunması fürsətini əldən verməyib, "Vəsiyyət təşəbbüsü"nü gerçəkləşdirsinlər.

«Vəsiyyət təşəbbüsü» - biz bunu, ona görə belə adlandırmışıq ki, mahiyyət etibarilə xristianlarla bağlanmış bu müqavilələr vəsiyyət kimi bütün dövrlər üçün müsəlmanlara ünvanlanıb və bu gün də gündəmdədir. Buna görə də biz üzümüzü sünni, şiə, sufi olmasından asılı olmayaraq bütün müsəlmanlara, hüquq və mənəviyyat elmləri tədris edən məktəblərə, alim və qeyri alimlərə tutub, aşağıdakı deklarasiya altında öz adlarını yazmağa çağırırıq.

Biz aşağıda imza edənlər, özümüzü peyğəmbərin (Allahın xeyir-duası onun üzərindən əskik olmasın!) dünya xristianları ilə bağladığı sazişlərin ruh və hərf davamçıları sayırıq, o mənada ki, əgər onların həqiqiliyi təsdiq olunubsa, onda bu vəsiyyətlər Şəriət qanunlarında qüvvəyə minsin. Hər halda, şəriətdə onlar ənənəvi şəkildə və düzgün təbliğ olunsa, orda bu vəsiyyətlərə qarşı çıxa biləcək heç bir şey yoxdur.

Bir qardaş olaraq, terrorun, allahsızlığın, yanlış dini alqılamaların qurbanı olanların aqibəti bizi də kədərləndirir və biz bunu müsəlmanların dərdi kimi qəbul edirik.

Qoy rəhman olan Allah özü günahsız və mömin bəndələrinin əzablarını görsün. Və bizi öz iradəsinə tabe etməklə möhkəmləndirsin, xristianlarla bütün məsələlərdə Məhəmməd peyğəmbərin bağladığı sazişlərin məzmununun və ruhunun arxasınca aparsın.

Mərhəmətli və rəhmli Allahın adıyla!

Dünyanın himayədarı Böyük Allaha eşq olsun!

Biz bu deklarasiyanı və imzaları çatma yerinə uyğun, "Məhəmməd peyğəmbərin dünya xristianları ilə müqaviləsi" kitabının nüsxəsi ilə bərabər Yaxın Şərqə, Afrikaya eləcə də hazırda müsəlman "ekstremistləri"nin qurbanına çevrilən adamlara, xristian dini icmalarının başçılarına göndərməyə hazırıq.

Keçmişdə islam adı altında partlayış və qətllər törədən(allah eləməmiş, yenə baş verə bilər)adamlara qarşı, bunu tam əminliklə deyirəm, mübarizə aparmaq fürsəti var. İslam diniylə, yanlış yolda olan islam ekstremizmini eyniləşdirən qeyri-müsəlman və xristianların düşüncəsindən bu fikri çıxarmaq məqamıdır.

Son iki əsr müddətində İslam dini, praktik olaraq, Qərb dünyası ilə bütün sahələrdə uduzmuş vəziyyətdə idi.

Hazırda da İslam dini həm xaric, həm də daxildən hücumlara məruz qalır. Bəs onda biz müsəlmanlar niyə bəşəriyyətin diqqətini xristianların əzablarına çəkməliyik? Bunun əsas səbəblərindən biri budur ki, o kəslər ki, özləri bu gün əzablara məruz qalıblar, onlar Əzəmətli Cəngavərlik aktına sahibdirlər.

Müəyyən tələblərlə gələn adamlar insanları özlərindən uzaq salırlar. Kim ki, kömək təklifiylə gəlir, onlar əksinə özlərinə cəlb edirlər.

Artıq müsəlmanlar üçün o məqam gəlib çatıb ki, "axı biz terrorçu deyilik" sözlərinin çərçivəsindən çıxsınlar.

Bu kəlam öz həqiqətiylə, təəssüf ki, qeyri-müsəlmanlar üçün özünə haqq qazandırmaq kimi səslənir.

Artıq yolunu azmış müsəlmanların hücumlarına məruz qalan dinc xristianların müdafiəsinə qalxmaq üçün sərt mövqe tutmaq və aktiv, güclü ölçü götürmək zamanı gəlmişdir. Və bunu Məhəmməd peyğəmbərin adıyla, onun iradəsiylə yazılan qədim sənədlərin əsasında etmək gərəkdir.

Bizim layihə, inşallah, üç xeyirxah mərama söykənir və zərurət yarandıı üçün açıqlamaı lazım bilirik:

1) biz müsəlmanları o kəslərə qarşı müharibəyə cəlb edəcəyik ki, o adamlar insanların səbrini imtahana çəkir;

2) biz günahsız adamların müdafiəsinə qalxa bilərik;

3) biz, bu vəsiyyətləri bizə bəxş edən Məhəmmədin və eləcə də böyük Allahın nəzərində yüksəlmək naminə onların vəsiyyətlərini ləyaqətlə yerinə yetirəcəyik.

Dünya xeyirxah hisslərin təntənəli ifadəsi və sülh konfranslarındakı şablon nitqlərlə heç nəyə nail ola bilmir. Bu vəziyyət yalnız o zaman dəyişəcək ki, gözünün qabağında baş verən münaqişələri görən hər kəs Allah haqqında düşünəcək.

Çox nadir hallarda olur ki, strateji düşüncə, yüksək mənəviyyat və Allahın mərhəməti bir araya gəlir, beləliklə, bəlli bir hərəkət kursu müəyyənləşdirmək və onu şəyata keçirmək mümkün olur.

Biz düşünürük ki, Vəsiyyət təşəbbüsü yuxarıdakı üç humanist məramın həyata keçməsi istiqamətində bir fürsətdir.

Əgər hansısa müsəlman Məhəmməd peyğəmbərin kitabını oxuduqdan sonra vicdanı hərəkətə gələrsə, unutmasın ki, heç kəs onun yerinə düşünməyəcək, sizi əməlinizdən döndərməyəcək, çünki dində məcburiyyət yoxdur, ona görə adınızı bu vəsiyyət təşəbbüsünə yazın.